BEŞİKDƏN QƏBİR EVİNƏDƏK ÖYRƏNİN!
Məhəmməd Peyğəmbər (S.)

# GƏNC MÜƏLLİM

QƏZET 01.02.1958-ci İLDƏN ÇIXIR

İyun 2017
№ 4 (1083)

AZƏRBAYCAN DÖVLƏT PEDAQOJİ UNİVERSİTETİNİN QƏZETİ

## "Məktəbəqədər təhsil haqqında" Azərbaycan Respublikasının 2017-ci il 14 aprel tarixli 585-VQ nömrəli Qanununun tətbiqi barədə
### Azərbaycan Respublikası Prezidentinin Fərmanı



Azərbaycan Respublikası Konstitusiyasının 109-cu maddəsinin 19-cu və 32-ci bəndlərini rəhbər tutaraq "Məktəbəqədər təhsil haqqında" Azərbaycan Respublikasının 2017-ci il 14 aprel tarixli 585-VQ nömrəli Qanununun qüvvəyə minməsi ilə əlaqədar həmin qanunun tətbiqini təmin etmək məqsədi ilə **qərara alıram:**

1. Azərbaycan Respublikasının Nazirlər Kabineti:

1.1. altı ay müddətində:

1.1.1. Azərbaycan Respublikası qanunlarının və Azərbaycan Respublikası Prezidentinin aktlarının "Məktəbəqədər təhsil haqqında" Azərbaycan Respublikasının Qanununa uyğunlaşdırılması ilə bağlı təkliflərini Azərbaycan Respublikasının Prezidentinə təqdim etsin;

1.1.2. Azərbaycan Respublikası Nazirlər Kabinetinin normativ hüquqi aktlarının həmin qanuna uyğunlaşdırılmasını təmin etsin və bu barədə Azərbaycan Respublikasının Prezidentinə məlumat versin;

1.1.3. həmin qanunun 4.0.19-cu maddəsinə uyğun olaraq, məktəbəqədər təhsil müəssisələrinə qəbul qaydasını müəyyən etsin və bu barədə Azərbaycan Respublikasının Prezidentinə məlumat versin;

1.1.4. həmin qanunun 5.4-cü maddəsinə uyğun olaraq, sağlamlıq imkanları məhdud olan məktəbəqədər yaşlı uşaqların təhsilinin dövlət standartlarını müəyyən etsin və bu barədə Azərbaycan Respublikasının Prezidentinə məlumat versin;

1.1.5. həmin qanunun 8.8-ci maddəsinə uyğun olaraq, ailə tipli, icma əsaslı, qısamüddətli təlim qruplarında məktəbəqədər təhsilin təşkili qaydasını müəyyən etsin və bu barədə Azərbaycan Respublikasının Prezidentinə məlumat versin;

1.1.6. həmin qanunun 14.3-cü maddəsinə uyğun olaraq, məktəbəqədər təhsil müəssisəsində əlavə müayinə və müalicəyə ehtiyacı olan uşaqlara əlavə müalicə-bərpa xidməti göstərilməsi qaydasını müəyyən etsin və bu barədə Azərbaycan Respublikasının Prezidentinə məlumat versin;

1.1.7. həmin qanunun 18.2.10-cu maddəsinə uyğun olaraq, məktəbəqədər təhsil sahəsində təhsilverənlərin tibbi müayinədən keçməsi qaydasını müəyyən etsin və bu barədə Azərbaycan Respublikasının Prezidentinə məlumat versin;

1.1.8. həmin qanunun 20.2-ci maddəsinə uyğun olaraq, dövlət məktəbəqədər təhsil müəssisələrində təhsilalanların sosial müdafiəsi qaydasını müəyyən etsin və bu barədə Azərbaycan Respublikasının Prezidentinə məlumat versin;

1.1.9. həmin qanunun 21.5-ci maddəsinə uyğun olaraq, dövlət məktəbəqədər təhsil müəssisəsinə məxsus daşınmaz əmlakın qorunması və ərazisinin mühafizəsi ilə bağlı normativləri müəyyən etsin və bu barədə Azərbaycan Respublikasının Prezidentinə məlumat versin;

1.1.10. həmin qanunun 22.2-ci maddəsinə uyğun olaraq, dövlət məktəbəqədər təhsil müəssisəsini maliyyələşdirmə normativlərini müəyyən etsin və bu barədə Azərbaycan Respublikasının Prezidentinə məlumat versin;

1.1.11. həmin qanunun pozulmasına görə məsuliyyət növlərini müəyyən edən qanunvericilik aktının layihəsini hazırlayıb Azərbaycan Respublikasının Prezidentinə təqdim etsin;

1.2. həmin qanunun 14.2-ci, 23.3-cü və 23.7-ci maddələrində nəzərdə tutulmuş müvafiq icra hakimiyyəti orqanının səlahiyyətlərini, o cümlədən həmin qanunun 4.0.3-cü, 4.0.4-cü, 4.0.7-ci, 4.0.8-ci, 4.0.10-cu, 4.0.12-ci (məktəbəqədər təhsil müəssisəsinin akkreditasiyasını və işçilərinin attestasiyasını həyata keçirmək üzrə), 4.0.14-cü, 4.0.15-ci, 4.0.18-ci maddələrində nəzərdə tutulmuş vəzifələri həyata keçirəcək icra hakimiyyəti orqanları barədə təkliflərini üç ay müddətində hazırlayıb Azərbaycan Respublikasının Prezidentinə təqdim etsin;

1.3. mərkəzi icra hakimiyyəti orqanlarının normativ hüquqi aktlarının həmin qanuna uyğunlaşdırılmasını nəzarətdə saxlasın və bunun icrası barədə altı ay müddətində Azərbaycan Respublikasının Prezidentinə məlumat versin;

1.4. həmin qanundan irəli gələn digər məsələləri həll etsin.

2. Müəyyən edilsin ki:

2.1. "Məktəbəqədər təhsil haqqında" Azərbaycan Respublikası Qanununun 4.0.1-ci maddəsində (məktəbəqədər təhsil sahəsində dövlət siyasətini formalaşdırmaq üzrə) və 4.0.2-ci maddəsində (məktəbəqədər təhsilə dair normativ hüquqi aktları təsdiq etmək üzrə) nəzərdə tutulmuş vəzifələri Azərbaycan Respublikasının Prezidenti həyata keçirir;

2.2. həmin qanunun 5.2-ci, 5.4-cü, 8.2-ci maddələrində, 8.5-ci maddəsinin ikinci cümləsində, 8.8-ci, 9.1-ci, 9.3-cü, 14.1-ci, 14.3-cü, 14.5-ci, 15.8-ci, 18.2.10-cu, 20.2-ci, 21.5-ci, 22.2-ci, 22.3-cü, 23.1-ci maddələrində nəzərdə tutulmuş müvafiq icra hakimiyyəti orqanının səlahiyyətlərini, o cümlədən həmin qanunun

4.0.1-ci (məktəbəqədər təhsil sahəsində dövlət siyasətini həyata keçirmək üzrə), 4.0.2-ci (məktəbəqədər təhsilə dair normativ hüquqi aktlar, o cümlədən səmərəli təhsil modelinə əsaslanan dövlət təhsil standartları və proqramları (kurikulumlar) təsdiq etmək üzrə), 4.0.6-cı, 4.0.9-cu maddələrində, 4.0.12-ci (məktəbəqədər təhsil müəssisəsinin akkreditasiyası və işçilərinin attestasiyası qaydalarını müəyyən etmək üzrə) və 4.0.19-cu maddələrində nəzərdə tutulmuş vəzifələri Azərbaycan Respublikasının Nazirlər Kabineti həyata keçirir;

2.3. həmin qanunun 4.0.11-ci maddəsində nəzərdə tutulmuş vəzifələri Azərbaycan Respublikasının İqtisadiyyat Nazirliyi həyata keçirir;

2.4. həmin qanunun 15.3-cü maddəsində nəzərdə tutulmuş müvafiq icra hakimiyyəti orqanının səlahiyyətlərini, o cümlədən həmin qanunun 4.0.5-ci,

4.0.13-cü və 4.0.16-cı maddələrində nəzərdə tutulmuş vəzifələri yerli icra hakimiyyəti orqanlarının tabeliyində olan məktəbəqədər təhsil müəssisələrinə münasibətdə yerli icra hakimiyyəti orqanları həyata keçirirlər.

3. Azərbaycan Respublikasının Ədliyyə Nazirliyi mərkəzi icra hakimiyyəti orqanlarının normativ hüquqi aktlarının və normativ xarakterli aktların "Məktəbəqədər təhsil haqqında" Azərbaycan Respublikasının Qanununa uyğunlaşdırılmasını təmin edib Azərbaycan Respublikasının Nazirlər Kabinetinə məlumat versin.

**İlham ƏLİYEV,**
**Azərbaycan Respublikasının Prezidenti**
*Bakı şəhəri, 19 iyun 2017-ci il*

## 15 İyun - Milli Qurtuluş Gününə həsr olunmuş "Milli Qurtuluşdan intibaha" adlı tədbir

İyunun 12-də Yeni Azərbaycan Partiyasının (YAP) Mərkəzi Aparatının, Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) və "Səs" Media Qrupunun birgə təşkilatçılığı ilə universitetin Böyük Akt zalında 15 İyun-Milli Qurtuluş Gününə həsr olunmuş "Milli Qurtuluşdan intibaha" adlı tədbir keçirilib. Tədbirdə ADPU-nun rəhbərliyi, Dini Qurumlarla İş üzrə Dövlət Komitəsinin (DQİDK) sədri, YAP-ın icra katibinin müavini Mübariz Qurbanlı, Milli Məclisin deputatı, YAP-ın Səbail rayon təşkilatının sədri, professor Şəmsəddin Hacıyev, Milli Məclisin deputatı, "Yeni Azərbaycan" qəzetinin baş redaktoru Hikmət Babaoğlu, Milli Məclisin deputatı Mirkazım Kazımov, "Səs" Media Qrupunun rəhbəri, fəlsəfə üzrə fəlsəfə doktoru Behruz Quliyev, YAP-ın Siyasi Şurasının üzvü,"İki sahil" qəzetinin baş redaktoru, Əməkdar jurnalist Vüqar Rəhimzadə, universitetin professor-müəllim heyəti və tələbələri iştirak ediblər. Tədbirdə öncə Azərbaycan Respublikasının Dövlət Himni səsləndirilib, sonra isə 15 İyun-Milli Qurtuluş Gününü əks etdirən film nümayiş etdirilib.

Tədbirdə çıxış edən DQİDK-nin sədri, YAP-ın icra katibinin müavini Mübariz Qurbanlı bildirib ki, ötən əsrin 80-ci illərinin sonlarında-90-cı illərinin əvvəllərində Sovetlər Birliyinin süquta uğraması nəticəsində Azərbaycan yenidən öz dövlət müstəqilliyini bərpa etdi. Lakin Azərbaycanda müstəqil dövlət quruculuğuna Ermənistanın ölkəmizə qarşı başladığı hərbi təcavüz, eyni zamanda siyasi cəhətdən səriştəsiz, idarəçilik və dövlətçilik sahəsində heç bir təcrübəsi olmayan şəxslərin hakimiyyətdə təmsil olunmaları mane olurdu. Həmin dövrdə Azərbaycanın rəhbərliyində təmsil olunan təcrübəsiz və bacarıqsız şəxslər ölkədəki və dünyadakı siyasi vəziyyəti düzgün təhlil etməyi, dövlətin qarşısında dayanan strateji vəzifələri müəyyən edib həyata keçirməyi bacarmırdılar. Buna görə də 1991-1993-




cü illər Azərbaycanın müstəqillik tarixinə hərcmərclik, fəlakətli bir dövr kimi daxil olmuşdur. Yalnız ulu öndər Heydər Əliyevin xalqın böyük istəyi və inadlı tələbi ilə yenidən respublikamızda hakimiyyətə qayıtması Azərbaycanı siyasi-iqtisadi böhrandan, vətəndaş müharibəsi təhlükəsindən xilas etdi. Azərbaycanda daxili ictimai-siyasi sabitlik təmin edildi, ölkəmiz tərəqqi və inkişaf yoluna çıxdı. 15 İyun-Milli Qurtuluş Günü Milli Məclisin qərarı ilə 1997-ci il iyunun 27-də rəsmiləşdirildi. Həmin vaxtdan xalqımız 15 İyunu əlamətdar bir tarixi gün kimi qeyd edir və bu günü müstəqil Azərbaycan dövlətinin qurtuluşunun başlanğıcı kimi qiymətləndirir. Azərbaycan Respublikasının Prezidenti cənab İlham Əliyevin ümummilli liderimiz Heydər Əliyevin müdrik siyasi kursunu uğurla davam etdirməsi ölkəmizin böyük uğurlar qazanmasını təmin etmişdir.

Milli Məclisin deputatı, YAP-ın Səbail rayon təşkilatının sədri, professor Şəmsəddin Hacıyev çıxış edərək bildirib ki, xalqımız XX əsrdə iki dəfə öz dövlət müstəqilliyini əldə edib. Lakin XX əsrin əvvəllərində qazandığımız müstəqilliyi qoruyub saxlaya bilməmişik. XX əsrin sonlarında isə yalnız xalqımızın böyük oğlu, dünya şöhrətli siyasi və dövlət xadimi Heydər Əliyevin qətiyyəti, iradəsi, fədakarlığı, zəngin idarəçilik və dövlətçilik təcrübəsi sayəsində Azərbaycan öz dövlət müstəqilliyini qoruyub saxlaya bilib. Məhz ulu öndər Heydər Əliyevin siyasi uzaqgörənliyi və iradəsi nəticəsində iqtisadi inkişafımızın əsasını qoyan "Əsrin müqaviləsi" imzalanıb, Azərbaycanın ilk milli Konstitusiyası qəbul edilib, ölkəmiz sürətli inkişaf yoluna çıxıb. Hazırda bu inkişaf Azərbaycan Prezidenti İlham Əliyevin rəhbərliyi ilə yeni məzmun və keyfiyyətdə uğurla davam edir.

"Səs" Media Qrupunun rəhbəri, fəlsəfə üzrə fəlsəfə doktoru Behruz Quliyev çıxışında ulu öndər Heydər Əliyevin "Müstəqilliyin qazanılması nə qədər çətindirsə, onun qorunması daha da çətindir" müdrik fikrini xatırladıb. Qeyd edib ki, dahi öndər Heydər Əliyevin həyat və fəaliyyəti bu fikrin təsdiqi baxımından böyük əhəmiyyət kəsb edir. Ulu öndər Heydər Əliyev xarizmatik bir lider olaraq Azərbaycanı qarşılaşdığı təhlükə və faciələrdən xilas etdi, müstəqil dövlətimizi qurdu, gücləndirdi, onu dünya miqyasında layiqincə tanıtdı.



Bu gün dövlət başçımız İlham Əliyevin müstəqil və balanslaşdırılmış xarici siyasət həyata keçirməsi Azərbaycanın beynəlxalq nüfuzunun artmasını təmin etmiş, ölkəmiz dünya birliyinin layiqli tərəfdaşlarından birinə çevrilmişdir.

ADPU-nun rektoru, professor Cəfər Cəfərov çıxışında tədbirin rəhbərlik etdiyi ali təhsil müəssisəsində keçirilməsinə görə YAP-ın və "Səs" Media Qrupunun rəhbərliyinə, eləcə də millət vəkillərinə təşəkkür edib. Rektor bildirib ki, tariximizin gənclərə dərindən öyrədilməsi baxımından bugünkü tədbir mühüm əhəmiyyət kəsb edir. Azərbaycan müasir dövrün qarşıya qoyduğu hədəf və tələblərə uyğun inkişaf edir. Ölkəmizdə bütün sahələrə olduğu kimi, elm və təhsilin inkişafına da böyük qayğı və diqqət var. ADPU respublikamızın ali təhsil sistemində öz xüsusi yeri və mövqeyi ilə seçilir. ADPU-da həyata keçirilən struktur islahatlarından, təhsilin məzmununun yeniləşməsi sahəsində atılan ciddi addımlardan danışan rektor bildirib ki, universitetin kollektivi öz strateji hədəflərinə çatmaq üçün əzmlə çalışır.

Tarix və coğrafiya fakültəsinin III tədris ili tələbəsi Əhməd Ağababayev çıxış edərək bildirib ki, 15 İyun- Milli Qurtuluş Günü tariximizə böyük ictimai-siyasi əhəmiyyət kəsb edən bir gün kimi daxil olub. Biz tələbə-gənclər yaxşı oxumalı, bilik və bacarıqlara mükəmməl yiyələnməli, müstəqil ölkəmiz və dövlətimiz üçün yüksəkixtisaslı mütəxəssis və əsl vətəndaş kimi yetişməliyik.

**Mənsur İbrahimli**

# Yaz semestrinin imtahan sessiyası başladı

Azərbaycan Respublikasının Təhsil naziri cənab Mikayıl Cabbarovun "İmtahan sessiyasının təşkili və keçirilməsi barədə" imzaladığı 12 may 2017-ci il tarixli 50 nömrəli əmrdə ali və orta ixtisas təhsili müəssisələrində 2016-2017-ci tədris ilinin yaz semestrinin imtahan sessiyasının mövcud qaydalara uyğun təşkil edilməsi, tələbələrin biliyinin qiymətləndirilməsində şəffaflığın və obyektivliyin təmin olunması, imtahan sessiyasının mövcud normativ sənədlər əsasında keçirilməsi, təhsil müəssisələrində imtahan qərargahlarının yaradılması, bu qərargahlara daxil olan hər bir şikayətin qısa müddətdə çevik şəkildə zarətçi-müəllimlərin, münaqişə komissiyalarının tərkibi müəyyən edilib. İmtahan rəhbərləri və nəzarətçi-müəllimlər qeyri-ixtisas sahibləridir. İmtahanlar hər gün saat 9:00-da başlayır, 17:30-da bitir. Yazılı imtahanlar gün ərzində 3 dəfə- saat 9:00, 12:00, 15:00-da keçirilir. Test üsulu ilə hər 45 dəqiqədən bir imtahanlar keçirilir. Gün ərzində təxminən 2500 nəfər tələbə yazılı və test üsulu ilə imtahan verir.

İmtahan zallarında yanaşı oturan müxtəlif fakültələrin tələbələri ayrı-ayrı fənlərdən imtahan verirlər. Bu da onların bir-birinə kömək etmələrinin qarşısını alır. İmtahanların nəticələrinin təlimata müvafiq olaraq tələbələrə çat-



araşdırılıb lazımi tədbir görülməsi, eyni zamanda imtahanlarda şəffaflığın təmin edilməsi üçün ictimaiyyətin və tələbələrin valideynlərinin iştirakına şərait yaradılması öz əksini tapıb. Azərbaycan Dövlət Pedaqoji Universitetində (ADPU) bu əmrin icrası ilə bağlı yaz semestrinin imtahan sessiyasında yazılı və VTS-TEST sistemi üzrə tələbələrin imtahan nəticələrinin qiymətləndirilməsində olan şikayətləri araşdırmaq və düzgün qiymətləndirməni təmin etmək məqsədilə Apelyasiya Komissiyası, həmçinin fakültələr, Magistratura və doktorantura şöbəsi üzrə münaqişə komis- dırılması təmin edilir. İmtahanların keçirildiyi binalarda qayda-qanunlara riayət olunmasını təmin etmək üçün professor-müəllim heyətinin tərkibindən fakültələr üzrə növbətçilər müəyyənləşdirilib. ADPU-nun filialları imtahan sessiyasının gedişi haqqında mütəmadi olaraq Tədrisin İdarə Olunması və Tədris Texnologiyaları Mərkəzinə və rektorluğa məlumat verirlər.

Xatırladaq ki, builki tədris ilində ADPU-ya qəbul olunmuş I kurs tələbələrinin və arzu edən digər kurs tələbələrinin kollokvium və semester imtahanları yazılı qaydada aparılır.



siyaları yaradılmış, fakültə dekanlarının, kafedra müdirlərinin və digər struktur bölmələrin həyata keçirəcəkləri vəzifələr müəyyən edilmişdir. Sessiyanı normal mənəvi-psixoloji şəraitdə, obyektiv başa çatdırmaq üçün bütün hazırlıq işləri və təşkilati məsələlər vaxtında yekunlaşdırılmış, imtahanların keçirilməsi üçün lazımi sənədlər tələblərə uyğun hazırlanmışdır. İmtahan sessiyasının təşkil edilməsi və keçirilməsi üçün bütün fakültələrin əməkdaşlarından ibarət olan İmtahan qrupu yaradılıb. Apelyasiya komissiyası ADPU-nun Üzeyir Hacıbəyli küçəsi, 68 ünvanındakı I nömrəli tədris binasının II mərtəbəsində 247 nömrəli otaqda fəaliyyət göstərir. Apelyasiya komissiyasının telefon nömrəsi 498-17-94-dür. Eyni zamanda universitetdə İmtahan qərargahı yaradılıb. İmtahan qərargahı da ADPU-nun Üzeyir Hacıbəyli küçəsi, 68 ünvanındakı I nömrəli tədris binasının II mərtəbəsində 204 nömrəli otaqda fəaliyyət göstərir. İmtahan qərargahının telefon nömrəsi 498-19-04-dür. Bunlarla yanaşı, imtahanlara buraxılma, imtahanların təşkili, keçirilməsi qaydaları, imtahan koordinatorların vəzifələri, hüquqları və tələbələrin imtahanın gedişində hansı hərəkətlərə yol verməmələri barədə elanlar vurulmuşdur. İmtahan qərargahının və Apelyasiya komissiyasının əlaqə telefonları bütün tələbələrə elan edilmiş və universitetin saytında yerləşdirilmişdir. İmtahan qərargahına daxil olan hər bir şikayətin qısa müddətdə çevik araşdırılıb təmin edilməsi, imtahanların təşkilində və gedişində mənfi hallara yol vermiş şəxslər barədə universitetin rəhbərliyinə mütəmadi məlumat verilməsi tapşırılıb. Fakültələr, eləcə də Magistratura və doktorantura şöbəsi üzrə imtahanların gedişinə nəzarət edəcək imtahan rəhbərlərinin, nə- Məqsəd tədrisin keyfiyyətini yüksəltmək, şəffaflığı və obyektivliyi təmin etmək, eyni zamanda tələbə-gənclərin məntiqi təfəkkürünün, yaradıcı təxəyyülünün inkişaf etdirilməsinə və onların yazı mədəniyyətinin formalaşmasına kömək etməkdir. Digər kurslar isə Kompüter Mərkəzində elekron-test üsulu ilə imtahan verirlər. Yazılı imtahanların yoxlanılması üçün xüsusi otaq ayrılıb. Yazılı imtahanlar başa çatdıqdan sonra yazılar şifrələnir, yoxlanılır və həmin gün qiymətlər tələbələrə elan olunur. Günün sonunda isə bütün imtahanlarının nəticələri ADPU-nun İnternet saytına yerləşdirilir. İmtahandan aldığı qiymətlə razılaşmayan tələbələr fakültələr və universitet üzrə yaradılmış münaqişə komissiyalarına, həmçinin İmtahan qərargahına müraciət edə bilərlər. Eyni zamanda valideynlərlə əlaqələrin yaradılmasına, təhsil sahəsində fəaliyyət göstərən qeyri-hökumət təşkilatlarının və kütləvi informasiya vasitələri nümayəndələrinin ADPU-da olaraq imtahan prosesini izləmələrinə də xüsusi diqqət yetirilir ki, bu da ictimaiyyətdə imtahanların gedişi barədə dolğun təsəvvürün formalaşdırılmasına xidmət edir. İmtahan qərargahının üzvləri tərəfindən hər hansı bir müraciətin araşdırılması zamanı qəbul olunmuş qərar qarşı tərəfi qane etmədikdə və ya müraciətlər İmtahan qərargahının səlahiyyətlərinə aid olmadıqda rektorluğa müraciət edilir və qarşı tərəfin iştirakı ilə məsələyə baxılır.

Rektor Cəfər Cəfərov iyunun 5-də auditoriyalarda olaraq imtahan prosesini müşahidə etmiş, imtahanların çevik, şəffaf və obyektiv keçirilməsi üçün öz tapşırıq və tövsiyələrini vermiş, tələbələrə uğurlar arzulamışdır.

**Mahirə Mustafayeva**

# "Twinning" layihəsi çərçivəsində nəticələrin təhlili üzrə seminar

***İyunun 6-da Azərbaycan Dövlət Pedaqoji Universitetində (ADPU) "Twinning" layihəsi çərçivəsində nəticələrin təhlili üzrə seminar keçirilib. Seminarda ADPU-nun rəhbərliyi, Təhsil Nazirliyinin əməkdaşları, Finlandiyadan və Estoniyadan olan ali təhsil ekspertləri iştirak ediblər.***



ADPU-nun rektoru, professor Cəfər Cəfərov tədbiri giriş sözü ilə açaraq bildirib ki, bu gün universitetin həyatında mühüm bir gündür. Belə ki, "Twinning" layihəsi çərçivəsində ADPU üzrə qiymətləndirmənin yekun nəticələri açıqlanacaq. "Twinning" layihəsi universitetimizin ümumi inkişaf prosesinə böyük təkan verəcək. Rektor universitetin inkişafına verdikləri dəstəyə görə layihənin bütün iştirakçılarına təşəkkür edib və onlara uğurlar arzulayıb.

"Twinning" layihəsinin rəhbəri Heli Mattisen və layihə rəhbəri Helka Kekalainen çıxış edərək bildiriblər ki, Avropa İttifaqının maliyyə dəstəyi ilə həyata keçirilən "Twinning" layihəsi Azərbaycan ali təhsil sisteminin Avropa Ali Təhsil Məkanının (AATM) tələblərinə daha da uyğunlaşdırılması məqsədi ilə Təhsil Nazirliyinə dəstək verən bir layihədir. Layihənin hədəfi AATM-ə inteq-



rasiyanı gücləndirməklə Azərbaycanın ali təhsil sisteminin inkişafına nail olmaq, məqsədi isə Təhsil Nazirliyinin və ali təhsil müəssisələrinin institusional potensialını artırmaqdır. Layihə çərçivəsində ali təhsil sahəsində cari vəziyyət araşdırılıb, ali təhsil müəssisələrindən 550 nəfər müəllim, rəhbər şəxs və eləcə də Təhsil Nazirliyini təmsil edən təhsil mütəxəssisləri seminar və təlimlərə cəlb olunublar. Təlimlər keyfiyyət təminatı sahəsində bilik və bacarıqların artırılması və təlim nəticələrinin qiymətləndirilməsini əhatə edib. 2016-cı ilin iyun ayında Finlandiyanın Helsinki və Estoniyanın Tallin şəhərlərinə edilmiş bir həftəlik səfər azərbaycanlı mütəxəssislər üçün keyfiyyət təminatı sahəsində təşkil olunan təlimlərin bir hissəsi hesab oluna bilər. Layihə çərçivəsində ali təhsilin keyfiyyət təminatı üzrə Avropa Standartları və Təlimatlarına uyğun 3 ali təhsil müəssisəsi- Azərbaycan Dövlət Pedaqoji Universiteti, Azərbaycan Dövlət İqtisad Universiteti (UNEC) və Azərbaycan Texniki Universiteti (AzTU) pilot qiymətləndirmənin keçirilməsi üçün seçilib. Layihə çərçivəsində uğurlu nəticələr əldə edilib. Ötən ilin payızında özünüqiymətləndirmənin həyata keçirilməsi məqsədi ilə layihə tərəfindən pilot universitetlər üçün təlimlər təşkil olunub. Bu ilin payızında azərbaycanlı və avropalı mütəxəssislərdən təşkil olunmuş qiymətləndirmə qrupları AzST adlı sənəd layihəsinə əsaslanaraq sınaq qiymətləndirmələr həyata keçirəcəklər. Pilot universitetlərdə aparılan qiymətləndirmə təcrübəsinə əsaslanaraq fin, eston və azərbaycanlı mütəxəssislər tərəfindən Azərbaycanın Ali Təhsilində Keyfiyyətin Təminatı üzrə Standartlar və Təlimatlarla bağlı yekun tövsiyələr işlənib hazırlanacaq.

Seminarda beynəlxalq qiymətləndirmə qrupunun üzvü Hannu Apajalahti slaydlar vasitəsilə ADPU üzrə qiymətləndirmənin əsas nəticələrinin təqdimatı ilə çıxış edib. Bildirib ki, ADPU-nun Özünüqiymətləndirmə hesabatı tələbkarlıqla, yüksək səviyyədə hazırlanıb, reallığa və mövcud vəziyyətə uyğundur, universitetin hədəfləri və vəzifələri burada öz əksini tapıb. ADPU rəhbərliyinin universitetin inkişaf strategiyası ilə bağlı qətiyyətli mövqeyi var və bu strategiyanı həyata keçirmək üçün ardıcıl və səmərəli fəaliyyət göstərir. Universitetin professor-müəllim heyəti və tələbə kollektivi dəyişikliklərə hazırdır. Xarici ali təhsil ekspertləri ADPU-nun müasir tələblərə uyğun fəaliyyət göstərməsi, idarəetmənin optimallaşdırılması, universitetin inkişaf strategiyasının prioritetlər əsasında hazırlanması, Elmi Şuranın fəaliyyətinin təkmilləşdirilməsi, tədris və elmi-tədqiqat sahələrinin yeni çağırışlara uyğun qurulması, tələbələrin bilik və bacarıqlarının artırılması, gənc mütəxəssislərin işə cəlb edilməsi, insan resurslarının inkişaf etdirilməsi, təhsil proqramlarının dövlət standartlarına uyğun hazırlanması, bu proqramların müntəzəm olaraq yenilənməsi, tələbələrin fikir və təkliflərinin nəzərə alınması, pedaqoji təcrübənin səmərəli təşkili, elektron kitabxanaya çıxış imkanlarının təmin edilməsi, təhsilin beynəlmiləşdirilməsi, beynəlxalq əlaqələrinin genişləndirilməsi, xarici tələbə mübadiləsi proqramlarında iştirak edilməsi, universitetdə karyerə mərkəzinin yaradılması, məzunlarla işin gücləndirilməsi və digər vacib məqamlarla bağlı öz tövsiyələrini veriblər.

Tədrisin İdarə Olunması və Tədris Texnologiyaları Mərkəzinin direktoru, dosent Sənan Əliyev çıxışında Özünüqiymətləndirmə hesabatının müşahidə, müzakirə və təhlillərə əsasən hazırlandığını bildirib. Dosent S.Əliyev xarici ali təhsil ekspertlərinin rəy və təklifləri nəzərə alınmaqla ADPU-nun müasir səviyyədə fəaliyyət göstərməsi üçün yeni Nizamnaməsinin qəbul ediləcəyini, konkret məqsəd və vəzifələri özündə ehtiva edən yeni inkişaf strategiyasının hazırlanacağını, yeni tədris ili üçün tamamilə yeni strukturun yaradılacağını, çevik və səmərəli idarəetmə mexanizminin qurulacağını, tədris prosesinin təşkilinin təkmilləşdiriləcəyini, Himayədarlar Şurasının formalaşdırılacağını, Məzunlarla iş şöbəsinin yaradılacağını, universitetin İKT imkanlarının yaxşılaşdırılacağını, elmi-tədqiqat laboratoriyaların dövlət sifarişli qrantlar əsasında fəaliyyət göstərəcəyini, beynəlxalq əlaqələrin gücləndiriləcəyini, professor-müəllim və tələbə mübadiləsinin həyata keçiriləcəyini diqqətə çatdırıb.

Seminarda səmərəli müzakirə aparılıb, maraqlı və dəyərli fikirlər səsləndirilib.

Sonda rektor Cəfər Cəfərov vurğulayıb ki, layihə iştirakçılarının rəy və təklifləri nəzərə alınacaq, bu rəy və təkliflər universitetin kollektivi üçün strateji yol xəritəsi rolunu oynayacaq.

**Könül Nəzərova**

# “Fənlərin tədrisi problemləri: reallıqlar və perspektivlər” Respublika elmi-praktik konfransı

**İyunun 21-də Azərbaycan Dövlət Pedaqoji Universitetində (ADPU) “Fənlərin tədrisi problemləri: reallıqlar və perspektivlər” Respublika elmi-praktik konfransı keçirilib. Konfransda öncə Azərbaycanın Dövlət Himni səsləndirilib.**

Konfransı giriş sözü ilə açan ADPU-nun rektoru, professor Cəfər Cəfərov bildirib ki, bugünkü konfrans universitetin keçirdiyi respublika və beynəlxalq miqyaslı konfranslar silsiləsinə daxildir. Konfrans ADPU üçün mühüm və məsuliyyətli bir dövrdə keçirilir. Hazırda ADPU-da yaz semestrinin imtahan sessiyası davam edir. Eyni zamanda kafedralarda tədris olunan fənlər üzrə vakant professor, dosent, baş müəllim və müəllim vəzifələrini tutmaq üçün keçirilən müsabiqə, eləcə də tədris-yardımçı heyətin və Kitabxana-İnformasiya Mərkəzinin əməkdaşlarının 3 mərhələdən ibarət attestasiyası yekunlaşma mərhələsindədir. Şəffaf və obyektiv keçirilən müsabiqənin və attestasiyanın əsas məqsədi yüksək bilik və peşəkarlığa malik müəllimləri və mütəxəssisləri işə cəlb etməkdir. Müsabiqə və attestasiya bizə daha yaxşı müəllimləri və mütəxəssisləri işə cəlb etmək imkanı verir və nəticə etibarilə qarşımıza qoyduğumuz məqsəd və hədəflərə yaxınlaşdırır. Son məqsədimiz, hədəfimiz isə ölkəmiz üçün yüksək səviyyəli müəllimlər hazırlamaqdır. Qeyd edib ki, ADPU yeni tədris ilinin əvvəlində 2 beynəlxalq elmi konfrans keçirəcəkdir. Rektor çıxışının sonunda konfrans iştirakçılarına müzakirələrdə fəal iştirak etməyi, ortaya əməli nəticələr qoymağı və bütövlükdə tədris prosesini müasir tələblərə uyğun qurmağa tövsiyə edərək konfransın işinə uğurlar arzulayıb.



Elmi işlər üzrə prorektor, professor Asəf Zamanov çıxışında qeyd edib ki, konfrans hazırda ADPU-da həyata keçirilən islahatlar, insan resurslarının inkişaf etdirilməsi sahəsində aparılan tədbirlərlə bir-birini tamamlayır. Mütəxəssis hazırlığının yüksəldilməsi ali təhsilin yeniləşməsi üçün mühüm əhəmiyyət kəsb edir. Tədris prosesinin təşkilində ən vacib məqamlardan biri müəllim hazırlığıdır. Eyni zamanda yeni, müasir tələblərə cavab verən dərsliklərin hazırlanması, dissertasiya mövzularının təkmilləşdirilməsi, informasiya-kommunikasiya texnologiyalarından istifadənin miqyasının daha da genişləndirilməsi bu işdə önəmli rol oynayır. Professor A.Zamanov çıxışının sonunda universitetdə Müəllimlərin bilik və peşəkarlıq səviyyəsinin yüksəldilməsinə kömək ola biləcək Müəllimlərin Modernləşməsi Mərkəzinin yaradılmasını təklif edib.

İbtidai təhsil fakültəsinin dekanı, professor Fərrux Rüstəmov çıxış edərək konfransın həm universitetin, həm də ölkəmizin elmi-mədəni həyatı üçün mühüm əhəmiyyət kəsb etdiyini bildirərək fənlərin tədrisi metodikasına səmərəli təsir edəcəyini vurğulayıb.

Sonra konfrans öz işini 3 elmi bölmədə-Riyaziyyat, informatika və təbiət elmləri, Humanitar və ictimai elmlər, Pedaqoji-psixoloji elmlər bölmələrində davam etdirib. Konfransda ümumilikdə 130 məruzə dinlənilib. Məruzələrdə fənlərin tədrisinin məqsəd və vəzifələri, mövcud vəziyyəti, aktual problemləri, imkan və perspektivləri, fənlərarası əlaqə, internet resurslarından və informasiya-kommunikasiya texnologiyalarından istifadə, xarici dillərin tədrisinə müasir yanaşmalar və innovativ metodlardan istifadə, müəllim-şagird, müəllim-valideyn münasibətlərin humanistləşdirilməsi, şagird şəxsiyyətinin formalaşmasında səriştəli müəllim amili, tələbələrdə kreativ düşüncənin formalaşdırılması, ali təhsildə distant təhsilin həyata keçirilməsi üçün istifadə olunan texnologiyalar, təhsildə keyfiyyətin idarə olunmasında beynəlxalq təhsil tədqiqatlarının rolu, təlim prosesində yeni öyrənmə modelləri, mənəvi-əxlaqi dəyərlərin təhsilə tətbiqi, pedaqoji təcrübə üçün innovativ sistemin yaradılmasının zəruriliyi, ali məktəbdə təhsilin məzmununa texnoloji yanaşmaların xüsusiyyətləri və digər mühüm məqamlar yüksək səviyyədə öz əksini tapıb. Bölmə iclaslarında məruzələr müzakirə edilib, maraqlı və dəyərli təkliflər irəli sürülüb.

Konfransın sonunda bölmə rəhbərlərinin hesabatları dinlənilib, yekun qərar qəbul edilib.

**Mənsur Qüdrətoğlu**

# Yaz semestrinin imtahan sessiyasının monitorinqi

***İyun ayının 14-də Azərbaycan Dövlət Pedaqoji Universitetində (ADPU) fəaliyyət göstərən İctimai Şura 2016-2017-ci tədris ilinin yaz semestrinin imtahan sessiyasının monitorinqini keçirib.***

Monitorinqdə İctimai Şuranın üzvləri: Korrupsiyaya Qarşı Mübarizə Fondunun icraçı direktoru Vasif Mövsümov, “Cəmiyyət və Vətəndaş Münasibətləri” İctimai Birliyinin sədri Əhməd Abbasbəyli, Şəmsi Əsədullayev Xeyriyyə İctimai Birliyinin icraçı direktoru Cəsarət Hüseynzadə, Dövlət Quruculuğu Araşdırmaları Mərkəzinin rəhbəri İslam Məmmədov, ADPU-dan İctimai Şuranın üzvü, Həmkarlar İttifaqı Komitəsinin sədri, dosent Vaqif Əliyev, Təhsil İnstitutunun Təhsil Resursları Mərkəzinin Metodiki təhlil sektorunun müdiri, dosent Rasim Abdulrazaqov və kütləvi informasiya vasitələrinin nümayəndələri iştirak ediblər. Monitorinqin keçirilməsində məqsəd ictimaiyyəti ADPU-da yaz semestrinin imtahan sessiyasının keçirilməsi ilə bağlı geniş və ətraflı məlumatlandırmaq olmuşdur. Qeyd etmək lazımdır ki, ölkəmizdə həyata keçirilən təhsil islahatlarının əsas istiqamətlərindən biri olan ictimai iştirakçılığın miqyasının genişləndirilməsinə və bütövlükdə təhsilin keyfiyyətinin yüksəldilməsinə xidmət edən bu monitorinqlərin ADPU-da ardıcıl keçirilməsinə xüsusi diqqət yetirilir.

Monitorinqdən öncə ADPU-nun Tədrisin İdarə Olunması və Tədris Texnologiyaları Mərkəzinin direktoru, dosent Sənan Əliyev və həmin mərkəzin direktor müavini, dosent Ənvər İmanov yaz semestrinin imtahan sessiyası barədə məlumat veriblər. Bildirilib ki, universitetdə yaz semestrinin imtahan sessiyası iyunun 5-də başlayıb, iyunun 30-da başa çatdırılması nəzərdə tutulur. Təhsil naziri cənab Mikayıl Cabbarovun “İmtahan sessiyasının təşkili və keçirilməsi barədə” imzaladığı 12 may 2017-ci il tarixli 50 nömrəli əmrdə ali və orta ixtisas təhsili müəssisələrində 2016-2017-ci tədris ilinin yaz semestrinin imtahan sessiyasının mövcud qaydalara uyğun təşkil edilməsi, tələbələrin biliyinin qiymətləndirilməsində şəffaflığın və obyektivliyin təmin olunması, imtahan sessiyasının mövcud normativ sənədlər əsasında keçirilməsi, təhsil müəssisələrində imtahan qərargahlarının yaradılması, bu qərargahlara daxil olan hər bir şikayətin qısa müddətdə çevik şəkildə araşdırılıb lazımi tədbir görülməsi, eyni zamanda imtahanlarda şəffaflığın təmin edilməsi üçün ictimaiyyətin və tələbələrin valideynlərinin iştirakına şərait yaradılması öz əksini tapıb. ADPU-da bu əmrin icrası ilə bağlı universitetin rektoru, professor Cəfər Cəfərov müvafiq əmrləri ilə yaz semestrinin imtahan sessiyasında yazılı və VTS-TEST sistemi üzrə tələbələrin imtahan nəticələrinin qiymətləndirilməsində olan şikayətləri araşdırmaq və düzgün qiymətləndirməni təmin etmək məqsədilə Apelyasiya Komissiyası, həmçinin fakültələr, Magistratura və doktorantura şöbəsi üzrə apelyasiya komissiyaları yaradılmış, fakültə dekanlarının, kafedra müdirlərinin və digər struktur bölmələrin həyata keçirəcəkləri vəzifələr müəyyən edilmişdir. Sessiyanın normal mənəvi-psixoloji şəraitdə, obyektiv başa çatdırmaq üçün bütün hazırlıq işləri və təşkilati məsələlər vaxtında yekunlaşdırılmış, imtahanların keçirilməsi üçün lazımi sənədlər tələblərə uyğun hazırlanmışdır.





İmtahan sessiyasının təşkil edilməsi və keçirilməsi üçün bütün fakültələrin əməkdaşlarından ibarət olan İmtahan qrupu yaradılıb. Apelyasiya Komissiyası ADPU-nun Üzeyir Hacıbəyli küçəsi, 68 ünvanındakı I nömrəli tədris binasının II mərtəbəsində 247 nömrəli otaqda fəaliyyət göstərir. Apelyasiya Komissiyasının telefon nömrəsi 498-17-94-dür. Eyni zamanda universitetdə İmtahan Qərargahı yaradılıb. İmtahan Qərargahı da ADPU-nun Üzeyir Hacıbəyli küçəsi, 68 ünvanındakı I nömrəli tədris binasının II mərtəbəsində 204 nömrəli otaqda fəaliyyət göstərir. İmtahan Qərargahının telefon nömrəsi 498-19-04-dür. Bunlarla yanaşı, imtahanlara buraxılma, imtahanların təşkili, keçirilməsi qaydaları, imtahan koordinatorларının vəzifələri, hüquqları və tələbələrin imtahanın gedişində hansı hərəkətlərə yol verməmələri barədə elanlar vurulmuşdur. İmtahan Qərargahının və Apelyasiya Komissiyasının əlaqə telefonları bütün tələbələrə elan edilmiş və universitetin saytında yerləşdirilmişdir. İmtahan Qərargahına daxil olan hər bir şikayətin qısa müddətdə çevik araşdırılıb təmin edilməsi, imtahanların təşkilində və gedişində mənfi hallara yol vermiş şəxslər barədə universitetin rəhbərliyinə mütəmadi məlumat verilməsi tapşırılıb. Fakültələr, eləcə də Magistratura və doktorantura şöbəsi üzrə imtahanların gedişinə nəzarət edəcək imtahan rəhbərlərinin, nəzarətçi-müəllimlərin, apelyasiya komissiyalarının tərkibi müəyyən edilib. İmtahan rəhbərləri və nəzarətçi-müəllimlər qeyri-ixtisas sahibləridir. İmtahanlar hər gün saat 9:00-da başlayır, 17:30-da bitir. Yazılı imtahanlar gün ərzində 3 dəfə- saat 9:00, 12:00, 15:00-da keçirilir. Test üsulu ilə hər 45 dəqiqədən bir imtahanlar keçirilir. Gün ərzində təxminən 2700 nəfər tələbə imtahan verir. Onlardan 1500 nəfəri test üsulu ilə , 1200 nəfəri isə yazılı imtahan verir.

İmtahan zallarında yanaşı oturan müxtəlif fakültələrin tələbələri ayrı-ayrı fənlərdən imtahan verirlər. Bu da onların bir-birinə kömək etmələrinin qarşısını alır. İmtahanların nəticələrinin təlimata müvafiq olaraq tələbələrə çatdırılması təmin edilir. İmtahanların keçirildiyi binalarda qayda-qanunlara riayət olunmasını təmin etmək üçün professor-müəllim heyətinin tərkibindən fakültələr üzrə növbətçilər müəyyənləşdirilib. ADPU-nun filialları imtahan sessiyasının gedişi haqqında mütəmadi olaraq Tədrisin İdarə Olunması və Tədris Texnologiyaları Mərkəzinə və rektorluğa məlumat verirlər.

Builki tədris ilində ADPU-ya qəbul olunmuş I tədris ili tələbələrinin və arzu edən digər tədris ili tələbələrinin kollokvium və semester imtahanları yazılı qaydada aparılır. Məqsəd tədrisin keyfiyyətini yüksəltmək, şəffaflığı və obyektivliyi təmin etmək, eyni zamanda tələbə-gənclərin məntiqi təfəkkürünün, yaradıcı təxəyyülünün inkişaf etdirilməsinə və onların yazı mədəniyyətinin formalaşmasına kömək etməkdir. Digər tədris ili tələbələri isə Kompüter Mərkəzində elekron-test üsulu ilə imtahan verirlər. Yazılı imtahanların yoxlanılması üçün xüsusi otaqlar ayrılıb. Yazılı imtahanlar başa çatdıqdan sonra yazılar şifrələnir, yoxlanılır və həmin gün qiymətlər tələbələrə elan olunur. Gününün sonunda isə bütün imtahanlarının nəticələri ADPU-nun İnternet saytına yerləşdirilir. İmtahandan aldığı qiymətlə razılaşmayan tələbələr Apelyasiya Komissiyasına və İmtahan Qərargahına müraciət edirlər. Eyni zamanda valideynlərlə əlaqələrin yaradılmasına, təhsil sahəsində fəaliyyət göstərən qeyri-hökumət təşkilatlarının və kütləvi informasiya vasitələri nümayəndələrinin ADPU-da olaraq imtahan prosesini izləmələrinə də xüsusi diqqət yetirilir ki, bu da ictimaiyyətdə imtahanların gedişi barədə dolğun təsəvvürün formalaşdırılmasına xidmət edir. İmtahan Qərargahının üzvləri tərəfindən hər hansı bir müraciətin araşdırılması zamanı qəbul olunmuş qərar qarşı tərəfi qane etmədikdə və ya müraciətlər İmtahan Qərargahının səlahiyyətlərinə aid olmadıqda rektorluğa müraciət edilir və qarşı tərəfin iştirakı ilə məsələyə baxılır.

Rektor Cəfər Cəfərov hər gün auditoriyalarda olaraq imtahan prosesini müşahidə edir, imtahanların çevik, şəffaf və obyektiv keçirilməsi üçün öz tapşırıq və tövsiyələrini verir. Bütövlükdə Redaqoji Universitetdə imtahan sessiyasının normal mənəvi-psixoloji şəraitdə və obyektiv keçirilməsi üçün bütün zəruri tədbirlər həyata keçirilir.

İmtahan Qərargahının rəhbəri, dosent Nurəddin Uluxanlı və Apelyasiya Komissiyasının sədri, dosent Nailə Hüseynova qərargaha və komissiyaya daxil olan müraciətlər barədə məlumat veriblər. Bildirilib ki, bugünədək İmtahan Qərargahına 53, Apelyasiya Komissiyasına isə 439 müraciət daxil olub. Müraciətlər çevik şəkildə, qanun çərçivəsində diqqətlə araşdırılıb və müvafiq qərarlar qəbul olunub.

Monitorinq zamanı QHT və KİV nümayəndələri, təhsil ekspertləri Apelyasiya Komissiyasında, İmtahan Qərargahında, imtahan zallarında, həmçinin yazılı imtahanların yoxlanılması üçün ayrılan xüsusi otaqlarda olaraq imtahanların gedişini və qiymətləndirilməsini izləyiblər. Tələbələr imtahan sessiyasının şəffaf və obyektiv keçirilməsindən razı qaldıqlarını bildiriblər. Sonda İctimai Şuranın üzvləri: Korrupsiyaya Qarşı Mübarizə Fondunun icraçı direktoru Vasif Mövsümov, “Cəmiyyət və Vətəndaş Münasibətləri” İctimai Birliyinin sədri Əhməd Abbasbəyli, Şəmsi Əsədullayev Xeyriyyə İctimai Birliyinin icraçı direktoru Cəsarət Hüseynzadə və digərləri çıxış edərək imtahan sessiyasının qanun çərçivəsində, şəffaf və ədalətli keçirdiyini vurğulayaraq tələbə-gənclərə uğurlar arzulayıblar.

**Nigar Zülfüqarqızı**

# Yaz semestrinin imtahan sessiyası başa çatdı

Azərbaycan Respublikasının Təhsil naziri cənab Mikayıl Cabbarovun "İmtahan sessiyasının təşkili və keçirilməsi barədə" imzaladığı müvafiq əmrə uyğun olaraq Azərbaycan Dövlət Pedaqoji Universitetində (ADPU) 2016-2017-ci tədris ilinin yaz semestrinin imtahan sessiyası iyun ayının 30-da başa çatdı. Qeyd edək ki, ADPU-da imtahan sessiyasının mövcud qaydalara uyğun təşkil edilməsi, tələbələrin biliyinin qiymətləndirilməsində şəffaflığın və obyektivliyin təmin olunması, daxil olan hər bir şikayətin çevik şəkildə araşdırılıb lazımi ölçü götürülməsi universitet rəhbərliyinin daim diqqət mərkəzində olub. İmtahanlar qrafikə uyğun olaraq hər gün saat 9:00-da başlayıb, 17:30-da başa çatıb. Yazılı imtahanlar gün ərzində 3 dəfə- saat 9:00, 12:00, 15:00-da keçirilib. Test üsulu ilə gün ərzində hər 45 dəqiqədən bir imtahanlar keçirilib. Gün ərzində təxminən 2700 nəfər tələbə imtahan verib. Onlardan 1500 nəfəri test üsulu ilə, 1200 nəfəri isə yazılı imtahan verib.



Bütün imtahanların nəticələri günün sonunda ADPU-nun İnternet saytına yerləşdirilib. İmtahan prosesinə heç bir kənar müdaxilə yol verilməyib, tələbələrin biliklərini nümayiş etdirmək üçün lazımi şərait yaradılıb. Məlumat üçün bildirək ki, sessiya müddətində ADPU-nun İmtahan Qərargahına 96 müraciət daxil olub. Onlardan 60-ı yazılı qaydada verilən imtahanlarla, 36-sı isə test üsulu ilə verilən imtahanlarla bağlı olub. Yazılı qaydada verilən imtahanlarla bağlı müraciət edən 60 nəfərin 44 nəfərinin imtahan zamanı telefondan istifadə etdiklərinə görə, 16 nəfərin isə konspektən istifadə etdiklərinə görə işləri protokallaşdırılıb və onların imtahan nəticələri ləğv edilib. Test üsulu ilə verilən imtahanlarla bağlı müraciət edən 38 nəfərdən 18-nin adı "qara siyahı"dan çıxarılıb və onların yenidən imtaha buraxılması təmin edilib, digərləri barədə isə müvafiq qərarlar qəbul edilib. Apelyasiya Komissiyasına isə 1055 müraciət daxil olub. Onlardan 905-i yazılı qaydada verilən imtahanlarla bağlı, 150-si isə test üsulu ilə verilən imtahanlarla bağlı olub. Araşdırılan 878 müraciətdən 451-i müsbət əldə edilib, digərləri isə qüvvəsində qalıb. Qalan müraciətlər araşdırılır. Məlumat üçün onu da qeyd edək ki, müxtəlif üzürlü səbəblərdən imtahanlarda iştirak edə bilməyən tələbələrin imtahanlarının iyunun 5-də başa çatdırılması nəzərdə tutulub.

Bunlarla yanaşı, imtahan sessiyasında müvəffəq qiymət ala bilməyən IV tədris ilinin tələbələrinə sessiya müddətində yenidən imtahan verərək dövlət imtahanlarına buraxılmaq imkanı yaradılıb. Eyni zamanda Təhsil Nazirliyinin son məlum əmrinə uyğun olaraq ADPU-da tələbələrə 2 fənni dinləmədən iyulun 7-dək akademik kredit borclarını ödəmək üçün lazımi şərait yaradılıb. Həmçinin universitetdə valideynlərlə əlaqələrin yaradılmasına, təhsil sahəsində fəaliyyət göstərən qeyri-hökumət təşkilatlarının və kütləvi informasiya vasitələri nümayəndələrinin, təhsil ekspertlərinin imtahan prosesini izləmələrinə də xüsusi diqqət yetirilib ki, bu da ictimaiyyətdə imtahanların gedişi barədə düzgün təsəvvürün formalaşdırılmasına xidmət edib. İmtahan prosesində nizam-intizam, səliqə-sahman təmin olunub, bütövlükdə imtahan prosesi mütəşəkkil təşkil edilib. ADPU-nun 5 filialında-Ağcabədi, Şəki, Şamaxı, Quba və Cəlilabad filiallarında, həmçinin ADPU-nun nəzdində Azərbaycan Dövlət Pedaqoji Kollecində də yaz semestrinin imtahan sessiyası şəffaf və ədalətli keçirilib.

ADPU-nun rektoru, professor Cəfər Cəfərov hər gün imtahan zallarında olaraq imtahan prosesini müşahidə edib, imtahanların çevik, şəffaf və obyektiv keçirilməsi üçün öz tapşırıq və tövsiyələrini verib. ADPU-da fəaliyyət göstərən İctimai Şura da imtahan prosesinə ciddi nəzarət edib. Bütövlükdə ADPU-da imtahan sessiyasının normal mənəvi-psixoloji şəraitdə, obyektiv keçirilməsi üçün bütün zəruri tədbirlər həyata keçirilib və sessiya uğurla yekunlaşıb.

**Nigar Abbasova**

## "Təhsil müəssisələrinin və icmaların fəlakət riskinə davamlılığı" mövzusunda təlim

İyunun 19-da Azərbaycan Dövlət Pedaqoji Universitetində (ADPU) Birləşmiş Millətlər Təşkilatının (BMT) Uşaq Fondunun (UNİCEF) təşkilatçılığı, Təhsil Nazirliyi, Fövqəladə Hallar Nazirliyi, Avropa Komissiyasının Humanitar Yardım və Mülki Müdafiə Departamentinin dəstəyi ilə "Təhsil müəssisələrinin və icmaların fəlakət riskinə davamlılığı" mövzusunda təlimin keçirilməsinə başlanılıb. Qeyd edək ki, təlim iyunun 23-nə qədər davam edib. Təlim Azərbaycanın təhsil müəssisələrində fəlakət riskinin qiymətləndirilməsi və idarəolunması metodologiyası ilə bağlı olub. Təlim ADPU-nun Mülki müdafiə və tibbi biliklərin əsasları kafedrasının və Mülki müdafiə qərargahının əməkdaşlarının iştirakı ilə keçirilib. Təlim iştirakçıları ilə qruplar şəklində respublikamızın müxtəlif regionları üzrə fəlakət amilləri, fəlakət risklərinin azaldılması və idarəolunması istiqamətində müzakirələr aparılıb.



**"Gənc müəllim"**

# Məzun gününə həsr edilmiş tədbir

İyunun 30-da Azərbaycan Dövlət Pedaqoji Universitetində (ADPU) Məzun gününə həsr edilmiş tədbir keçirilib. Tədbirdə Milli Məclisin deputatı Aydın Mirzəzadə, Azərbaycan Təhsil İşçiləri Azad Həmkarlar İttifaqı Respublika Komitəsi sədrinin müavini Mirzə Cəfərzadə iştirak ediblər. Öncə ulu öndər Heydər Əliyevin ADPU-dakı abidəsi önünə əklil və gül dəstələri qoyulub. Sonra Azərbaycanın Dövlət Himni səsləndirilib.





Tədbiri giriş nitqi ilə açan ADPU-nun rektoru, professor Cəfər Cəfərov məzunları və onların valideynlərini bu əlamətdar və xoş gün münasibətilə təbrik edib, məzunlara gələcək həyatlarında və müqəddəs müəllimlik fəaliyyətlərində böyük uğurlar arzulayıb.

Rektor Cəfər Cəfərov qeyd edib ki, müəllim bütün həyatı boyu öyrətməklə bərabər, həm də özü daim oxuyub-öyrənən, mütaliə edən, öz üzərində çalışan, bilik dairəsini genişləndirən bir şəxsdir. Ümummilli liderimiz Heydər Əliyev müəllim peşəsini yüksək qiymətləndirərək demişdir: "Həyatını müəllimliyə həsr edən insanlar, həqiqətən, fədakar, xalqına, millətinə sədaqətli və eyni zamanda qəhrəmanlıq göstərən insanlardır. Bizim həyatımızda müəllimlik ən hörmətli peşədir. Müəllim cəmiyyətimizdə görkəmli yer tutur. Orta məktəbdə, ali məktəbdə hər bir müəllim bilməlidir ki, onun üzərinə düşən vəzifə, onun dövlət üçün, millət üçün, Azərbaycan xalqı üçün gördüyü iş bütün başqa sahələrdə fəaliyyət göstərən insanların hamısının işindən ən gərəklisidir, ən lazımlısıdır. Azərbaycan ziyalıları arasında müəllimlər xüsusi yer tuturlar, hörmətə layiqdirlər, xüsusi qayğı və diqqətlə əhatə olunmalıdırlar. Mən Yer üzündə müəllimdən yüksək ad tanımıram".

Ulu öndərimiz Heydər Əliyevin müdrik və mütərəqqi ideyalarını uğurla davam etdirən Azərbaycan Respublikasının Prezidenti möhtərəm cənab İlham Əliyev müəllim adına, müəllim əməyinə yüksək qiymət verir. Dövlət başçımız İlham Əliyev demişdir: "Müəllimlər Azərbaycan cəmiyyətinin elitasıdır". Eyni zamanda Azərbaycanın Birinci vitse-prezidenti Mehriban xanım Əliyeva elm və təhsilin inkişafında əvəzsiz xidmətlər göstərir. Təhsil Nazirliyi tərəfindən "Gələcəyin müəllimi təqaüdü" təsis edilib. Bu təqaüd pedaqoji kadr hazırlığı aparılan ali təhsil müəssisələrinə qəbul imtahanlarında 500 və daha yüksək bal toplayan, ixtisas seçimində birinci və ya ikinci yerdə müəllimlik ixtisasını qeyd edən tələbələrə şamil olunur.



Rektor Cəfər Cəfərov çıxışı zamanı bildirib ki, bu il ADPU-nun 8 fakültə üzrə əyani şöbəsini 1944 nəfər, 7 fakültə üzrə qiyabi şöbəsini isə 306 nəfər (cəmi 2250 nəfər) məzun bitirir. Bu il ADPU-nun SABAH qruplarını 34 nəfər məzun bitirir. Cari ildə universiteti 16 nəfər əcnəbi tələbə bitirir. Builki tədris ilində ADPU-nun Ağcabədi Filialının əyani şöbəsini 5 ixtisas üzrə 115 nəfər, qiyabi şöbəsini isə 1 ixtisas üzrə 20 nəfər (cəmi 135 nəfər), Cəlilabad Filialının əyani şöbəsini 4 ixtisas üzrə 104 nəfə, qiyabi şöbəsini isə 1 ixtisas üzrə 21 nəfər (cəmi 125 nəfər), Şəki Filialının əyani şöbəsini 8 ixtisas üzrə 334 nəfər, Şamaxı Filialının əyani şöbəsini 5 ixtisas üzrə 133 nəfər, Quba Filialının əyani şöbəsini 6 ixtisas üzrə 167 nəfər məzun bitirir. Ümumilikdə bu il ADPU-nun 5 filialını 750 nəfər məzun bitirir. ADPU-nun nəzdində Azərbaycan Dövlət Pedaqoji Kollecini (ADPK) isə 11 ixtisas üzrə əyani şöbəni 1115, qiyabi şöbəni isə 318 nəfər (cəmi 1433) məzun bitirir. Bütövlükdə bu il ADPU-nu filiallar və ADPK ilə birlikdə 4433 nəfər məzun bitirir. Builki tədris ilində universitetin magistraturasını 25 ixtisas, 33 ixtisaslaşma üzrə 298 nəfər magistr bitirir.

Rektor Cəfər Cəfərov çıxışının sonunda bir daha məzun-gəncləri universiteti bitirmələri münasibətilə təbrik edib, onların gələcəkdə müstəqil ölkəmizin hərtərəfli inkişafına öz layiqli töhfələrini verəcəklərinə əminliyini ifadə edərək müvəffəqiyyətlər arzulayıb.

Tədbirdə çıxış edən millət vəkili Aydın Mirzəzadə məzunları universiteti bitirmələri münasibətilə təbrik edərək onlara uğurlar arzulayıb, xalqımıza və dövlətimizə layiqincə xidmət etməyi tövsiyə edib.

Musiqi, təsviri incəsənət, fiziki tərbiyə və çağırışaqədər hazırlıq fakültəsinin məzunu Gülgəz Cəfərzadə məzunlar adından çıxış edərək onlara göstərilən diqqət və qayğıya görə ADPU-nun rəhbərliyinə təşəkkür edib, universitetdə öyrəndikləri bilik və bacarıqların onların gələcək həyatında, peşə karyeralarında mühüm rol oynayacağını vurğulayıb.

Tədbirdə universiteti fərqlənmə diplomu ilə bitirən bakalavrlara və eləcə də magistraturanı fərqlənmə diplomu ilə başa vuran magistrlərə diplomlar təqdim edilib. Eyni zamanda universitetin ictimai-mədəni həyatında fəal iştirak edən, vətəndaş mövqeyi ilə fərqlənən tələbələrə diplomlar və təşəkkürnamə təqdim edilib, həmçinin bədii yaradıcılıq, idman sahələrində uğurlar qazanan tələbə-gənclər haqqında məlumat verilib. Sonra Məzun şarı havaya buraxılıb.



Tədbir məzun-gənclərin hazırladıqları bədii-musiqili kompozisiya və tanınmış incəsənət ustalarının iştirakı ilə konsert proqramı ilə davam edib.

**Nigar Zülfüqarqızı,**
**Mahirə Məhərrəmqızı**

## ADPU-nun əməkdaşları XİN-də görkəmli dövlət və elm xadimi Əziz Əliyevin 120 illik yubileyinə həsr olunmuş konfransda iştirak ediblər

Azərbaycan Respublikasının Prezidenti cənab İlham Əliyev 2016-cı il noyabr ayının 18-də görkəmli dövlət və elm xadimi Əziz Əliyevin 120 illik yubileyinin keçirilməsi haqqında Sərəncam imzalayıb. Həmin Sərəncama əsasən ölkəmizdə Əziz Əliyevin 120 illik yubileyinə həsr edilmiş müxtəlif tədbirlər keçirilir. Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) Elmi işlər üzrə prorektoru, professor Asəf Zamanov, Tarix və coğrafiya fakültəsinin dekanı, dosent Şahin Pənahov, Azərbaycan tarixi kafedrasının müdiri, dosent Naibə Əhmədova, Türk və Şərqi Avropa xalqları tarixi və tarixin tədrisi metodikası kafedrasının müdiri, dosent Rəcəb Əliyev, Azərbaycan tarixi kafedrasının professoru Xaqani Məmmədov, dosenti İradə Qasımova, baş müəllimləri Elman Mirzəyev, Bəşir Şükürov və Ümumi coğrafiya fakültəsinin əməkdaşları iyunun 8-də Xarici İşlər Nazirliyində (XİN) görkəmli dövlət və elm xadimi Əziz Əliyevin 120 illik yubileyinə həsr olunmuş “Görkəmli dövlət xadimi Əziz Əliyevin İkinci Dünya müharibəsi illərində İran və Dağıstanda ictimai-siyasi fəaliyyəti” mövzusunda keçirilən konfransda iştirak ediblər. Konfrans öz işini 2 sesssiyada davam etdirib.




Azərbaycan tarixi kafedrasının professoru Xaqani Məmmədov “Əziz Əliyevin 1941-1942-ci illərdə Sovet dövlətinin İrandakı hərbi və ictimai-siyasi heyətinin rəhbəri kimi fəaliyyəti” adlı 1-ci sessiyada “Əziz Əliyevin 1941-1942-ci illərdə Sovet dövlətinin İrandakı hərbi və ictimai-siyasi heyətinin rəhbəri kimi fəaliyyəti” mövzusunda geniş mühazirə edib. “Əziz Əliyevin 1942-1947-ci illərdə ÜKP(b)-nin Dağıstan Vilayət Komitəsinin birinci katibi kimi siyasi fəaliyyəti” adlı 2-ci sessiyada dosent Cavanşir Sadıqov “Əziz Əliyevin 1942-1947-ci illərdə ÜKP(b)-nin Dağıstan Vilayət Komitəsinin birinci katibi kimi siyasi fəaliyyəti” mövzusunda mühazirə edib. Məruzələrdə Əziz Əliyevin dövlət idarəçiliyinin təkmilləşdirilməsindəki səmərəli fəaliyyətinə toxunulub, onun respublikada səhiyyə sisteminin və tibb təhsilinin formalaşdırılmasına layiqli töhfələr verdiyi, eləcə də Azərbaycan və Dağıstan xalqları arasında dostluq və qardaşlıq əlaqələrinin daha da möhkəmləndirilməsi işində əvəzsiz xidmətlərindən danışılıb.

Əziz Əliyevin ailəsi adından çıxış edən akademik Cəmil Əliyev tədbirin təşkilinə görə təşəkkürünü bildirib.

Sonda xatirə şəkli çəkdirilib.

## ADPU-nun nəzdində ADPK-də dini radikalizmlə bağlı maarifləndirici xarakterli seminar-müşavirə

İyunun 8-də Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) nəzdində Azərbaycan Dövlət Pedaqoji Kollecində (ADPK) “Dini radikalizm və ekstremizmin yaranma səbəbləri, təzahür formaları və ona qarşı mübarizənin hüquqi əsasları” mövzusunda maarifləndirici xarakterli seminar-müşavirə keçirilib. Seminar-müşavirədə Dini Qurumlarla İş üzrə Dövlət Komitəsinin (DQİDK) sədrinin müavini Səyavuş Heydərov, ADPK-nin direktoru, hüquq üzrə fəlsəfə doktoru Qulu Novruzov, kollecin müəllim-tələbə heyəti iştirak edib. Tədbirdə ilk olaraq DQİDK-nın sifarişi ilə hazırlanan, dini radikalizm və bu cərəyanın qurbanlarından bəhs edən “Fitnə” sənədli filmi nümayiş olunub.





Filmin nümayişindən sonra çıxış edən kollecin direktoru Q.Novruzov bu cür tədbirlərin keçirilməsinin əhəmiyyətini vurğulayıb. Natiq qeyd edib ki, radikalizmə qarşı mübarizədən bəhs edən “Fitnə” filmi də dini maarifləndirmə sahəsində önəmli rola malikdir. Kollec direktoru tələbələrə radikal dini təsirlərə düşməmək və zərərli dini cərəyanlara qoşulmamaq üçün daha ayıq-sayıq olmağı tövsiyə edib.

DQİDK-nın sədr müavini S.Heydərov çıxışında dini radikalizmin yaranma səbəbləri və onun fəsadlarından bəhs edib. S.Heydərov Yaxın Şərqdə gedən proseslərə nəzər salaraq, dünyada aparıcı güclərin geosiyasi maraqlarını təmin etmələri üçün din amilindən istifadə etdiklərini diqqətə çatdırıb. Natiq vurğulayıb ki, bəzi qüvvələr sülh dini olan İslamı siyasiləşdirərək, qarşıdurma yaratmaqla onu gözdən salmağa yönələn siyasət həyata keçirirlər. S.Heydərovun sözlərinə görə, bəzi dairələr tərəfindən radikalyönümlü dini cərəyanların Azərbaycanda yayılmasına cəhdlər edilir. Lakin ölkəmizin müvafiq qurumları tərəfindən bu cür cəhdlərin qarşısı qətiyyətlə alınır. DQİDK-nın sədr müavini bu baxımdan gələcəyin müəllimləri olan tələbələrin ayıq-sayıqlığının artırılmasının və müəyyən bilgilərə yiyələnmələrinin, eyni zamanda onların dini radikalizmə qarşı mübarizədə fəal olmalarının vacibliyini diqqətə çatdırıb. O, tələbələri daha məsuliyyətli və diqqətli olmağa çağırıb. S.Heydərov onu da vurğulayıb ki, gənclər yad ideyalardan qorunmaları üçün müvafiq icazəsi olmayan ədəbiyyatlardan və saxta dini təqvimlərdən istifadə etməməlidirlər. S.Heydərov, eyni zamanda çıxışı zamanı Azərbaycan Respublikasının Prezidenti cənab İlham Əliyevin rəhbərliyi ilə ölkəmizdə mövcud olan ictimai-siyasi sabitlikdən və dövlət-din münasibələrindən danışıb.

## Fizika və texnologiya fakültəsində növbəti elmi seminar

İyunun 1-də Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) Fizika və texnologiya fakültəsində növbəti elmi seminar keçirilib. Seminarın işində universitetin rektoru, professor Cəfər Cəfərov iştirak edib. Seminarı giriş sözü ilə fakültənin dekanı, fizika üzrə fəlsəfə doktoru Arzu Daşdəmirov açıb. Fakültə elmi seminarının rəhbəri, dosent Aydın Ələkbərov çıxış üçün sözü məruzəçi Bakı Dövlət Universitetinin (BDU) Maddə quruluşu kafedrasının müdiri, Rusiya İctimai Elmlər Akademiyasının akademiki, professor Eldar Mənsimova verib.



Professor E.Mənsimov “Bioloji sistemlərdə suyun rolu və termodinamik halı” mövzusunda ətraflı çıxış edib. Çıxışdan sonra fakültənin əməkdaşlarından professor Şükür Əlizadə, professor İsa İsmayılov, dosent İltifat Dadaşov, dosent Cahangir Hüseynov, baş müəllim Ağaxəlil Əliyev, fizika üzrə elmlər doktoru X.Həsənov mövzu ilə bağlı məruzəçiyə müxtəlif suallarla müraciət ediblər.



Seminarın sonunda Ümumi fizika kafedrasının professoru Edil Eyvazov və fakültənin dekanı, fizika üzrə fəlsəfə doktoru üzrə Arzu Daşdəmirov məruzəçiyə dərin məzmunlu, maraqlı çıxışına görə təşəkkürlərini bildiriblər.

## Riyaziyyat və informatika fakültəsində pedaqoji təcrübənin yekununa həsr olunmuş konfrans




İyunun 1-də Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) Riyaziyyat və informatika fakültəsində IV tədris ilinin əyani təhsil alan Rİ-13-cü qrupunun tələbələrinin pedaqoji təcrübəsinin yekununa həsr olunmuş konfrans keçirilib. Tədbirdə fakültənin dekanı, riyaziyyat üzrə elmlər doktoru, dosent Maqsud Nəcəfov, Riyaziyyat və onun tədrisi metodikası kafedrasının müdiri, professor Azadxan Adıgözəlov, dekan müavini, dosent Allahverdi Cəfərov və universitetin pedaqoji təcrübə rəhbəri Solmaz Məmmədova çıxış edərək pedaqoji təcrübənin yekunları barədə ətraflı məlumat veriblər.

Qeyd edək ki, pedaqoji təcrübə tələbələrin böyük sevinc və marağına səbəb olmuşdur. Rİ-13-cü qrupun tələbələri Dilarə Vəlizadə, Aysel Mirzəliyeva və Aynur Bünyadzadə çıxış edərək fakültənin və məktəbin rəhbərliyinə, müəllimlərə onlara göstərdikləri diqqət və qayğıya görə öz təşəkkürlərini bildiriblər.



Sonda 82 nömrəli tam orta məktəbdə tələbənin pedaqoji təcrübə dövründə keçdiyi sınaq dərsinin slaydı təqdim edilib.

# İbtidai təhsil fakültəsində pedaqoji təcrübəyə həsr olunmuş konfrans



İyunun 1-də Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) İbtidai təhsil fakültəsinin "İbtidai sinif müəllimliyi" ixtisasının əyani şöbəsi üzrə son tədris ili tələbələrinin (408, 409, 410-cu qruplar) pedaqoji təcrübəsinin yekunlarına həsr olunmuş konfrans keçirilib. Konfransın işində ADPU üzrə pedaqoji təcrübə rəhbəri Solmaz Məmmədova, IV tədris ilinin tələbələri, fənn metodistləri, pedaqoq və psixoloqlar iştirak ediblər. Konfransı giriş sözü ilə açan fakültə dekanı, professor Fərrux Rüstəmov 16 fevral -31 may 2017-ci il tarixinədək Bakı şəhərinin 42, 47, 200 nömrəli tam orta məktəblərində keçirilən pedaqoji təcrübə haqqında ətraflı məlumat verib. Qeyd olunub ki, 42 nömrəli tam orta məktəbdə 21 nəfər tələbə, 47 nömrəli tam orta məktəbdə 20 nəfər tələbə, 200 nömrəli tam orta məktəbdə 20 nəfər tələbə "Ana dili", "Riyaziyyat", "Xarici dil", "Həyat bilgisi", "Fiziki tərbiyə", "Texnologiya", "Musiqi", "Təsviri incəsənət", "İnformatika" fənlərindən pedaqoji təcrübədə olub, sınaq dərsləri veriblər. Pedaqoji təcrübə tələbənin nəzəri hazırlığı ilə onun tədris-tərbiyə müəssisəsində müstəqil fəaliyyətini əlaqələndirir. Tələbə auditoriyada öyrəndiyi nəzəri bilikləri pedaqoji təcrübədə tətbiq edir və bununla da elmi biliklərin həyati əhəmiyyətini dərk edir, öyrəndiklərindən daha şüurlu və fəal surətdə istifadə etməyə çalışır. Tələbələr məktəbin təlim-tərbiyə işləri ilə tanış olur, ibtidai sinif müəlliminin köməkçisi kimi fəaliyyət göstərir, metodik işin təşkilində və tədqiqatçılıq fəaliyyətində yaxından iştirak edirlər.

ADPU üzrə pedaqoji təcrübə rəhbəri Solmaz Məmmədova çıxış edərək pedaqoji təcrübənin yüksək səviyyədə təşkilindən razılığını ifadə edib, məktəb rəhbərlərinin tələbələrlə bağlı xoş sözlərini tədbir iştirakçılarına çatdırıb. Tədbirdə çıxış edən pedaqoq və metodistlərdən dosent Aybəniz Haşimova, dosent Svetlana Məmmədova, baş müəllim Vəliyəddin Müsəllimov, baş müəllim Natiq Hacızadə, baş müəllim Gülsüm Kazımova, baş müəllim Gülnarə Məmmədova, tələbələrdən Qumral Aslanlı, İlahə Abdullayeva, Bilqeys Fətullayeva müəllim hazırlığında pedaqoji təcrübənin əhəmiyyətindən, təşkili və keçirilməsindən, tələbələrin sınaq dərslərinə hazırlaşması, dərsin müşahidəsi və təhlilindən danışıblar.



# ADPU-nun Quba Filialında Müasir Azərbaycan dili kafedrasının əməkdaşları ilə görüş

İyunun 2-də Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) Filologiya fakültəsinin Müasir Azərbaycan dili kafedrasının əməkdaşları Quba Filialında tələbə və müəllim kollektivi ilə görüşmüş, onlarla söhbət aparmış, rəy və təklifləri nova, filologiya üzrə fəlsəfə doktoru, dosent Könül Səmədova, filologiya üzrə fəlsəfə doktoru, dosent Zamiq Təhməzov, filologiya üzrə fəlsəfə doktoru, dosent Minaxanım Nəzərova, filialın direktoru, professor Əli Allahverdiyev, Tədris və el-



dinləmişlər. Həmçinin həmin kafedranın müdiri, filologiya üzrə elmlər doktoru Mahirə Hüseynovanın "Müasir Azərbaycan dili: Punktuasiya" kitabının təqdimati keçirilmişdir. Təqdimatda görkəmli alim, Müasir Azərbaycan dili kafedrasının banisi, Əməkdar elm xadimi, professor Həsən Mirzəyevin və həmin kafedranın əməkdaşlarının müxtəlif kitabları filialın Ədəbiyyat və dillər kafedrasına hədiyyə edilmişdir. Qeyd edək ki, görüş Müasir Azərbaycan dili kafedrasının və filialın Ədəbiyyat və dillər kafedrasının arasında başlanan işgüzar əməkdaşlıq münasibətlərinin nəticəsi kimi baş tutmuşdur.

Görüşdə filologiya üzrə elmlər doktoru, professor Mirvari İsmayılova, filologiya üzrə elmlər doktoru, professor Cəfər Cəfərov, filologiya üzrə fəlsəfə doktoru, dosent Sevinc Sadıqova, filologiya üzrə fəlsəfə doktoru, dosent Yeganə Qəhrəmami işlər üzrə direktor müavini, tarix üzrə fəlsəfə doktoru İsmayıl Mahmudov, tərbiyə işləri üzrə direktor müavini Aysel Şeydayeva, pedaqoji fakültənin dekanı, filologiya üzrə fəlsəfə doktoru, Qələmşah İdrisov, Ədəbiyyat və dillər kafedrasının müdiri, dosent Gülşən Ağabəy, kafedranın müəllimləri və tələbəgənclər iştirak etmişlər.

Görüşdə 100-ə yaxın kitab, dərs vəsaiti, proqram iştirakçılara təqdim olunmuş, M.Hüseynova kitablar, elmi əsərlər, proqramlar haqqında ətraflı məlumat vermiş, rəy və təklifləri dinləmişdir. M. Hüseynova qeyd etmişdir ki, əməkdaşlığımız daha da genişlənəcək, gələcəkdə müxtəlif birgə tədbirlər, seminarlar, ustad dərsləri təşkil olunacaq, qarşılıqlı fəaliyyət hər iki kafedranın, eləcə də bütün universitetin elmi potensialının yüksəldilməsinə, təhsilin keyfiyyətinin artırılmasına xidmət edəcəkdir.

# ADPU-nun nəzdində ADPK-də İctimai Şuranın üzvlərinin iştirakı ilə monitorinq




Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) nəzdində Azərbaycan Dövlət Pedaqoji Kollecində (ADPK) iyunun 22-də ADPU-nun İctimai Şurasının üzvlərinin iştirakı ilə 2016-2017-ci tədris ilinin yaz semestrinin imtahan sessiyasının təşkili və keçirilməsi ilə bağlı monitorinq keçirilib. Qeyd edək ki, İctimai Şuranın tərkibinə ölkədə fəaliyyət göstərən müxtəlif qeyri-hökumət təşkilatlarının və media qurumlarının rəhbərləri, həmçinin tanınmış təhsil ekspertləri daxildirlər.

Monitorinq zamanı Açıq Hökumət Platformasının koordinatoru Əliməmməd Nuriyev, Moderator.az saytının redaktoru Zülfüqar Hüseynzadə, təhsil ekspertləri Nadir İsrafilov, Etibar Əliyev kollecdə təşkil olunan imtahanların gedişini izləyib, imtahanların keçirildiyi auditoriyalara, cavabların kodlaşdırılması, yoxlanması və emalı otaqlarına baxış keçiriblər. Eyni zamanda tədbirin işıqlandırılması məqsədilə monitorinqdə müxtəlif kütləvi informasiya vasitələrinin nümayəndələri, televiziya əməkdaşları da iştirak ediblər.

Monitorinqdən öncə ADPU-nun nəzdində ADPK-nin direktoru, hüquq üzrə fəlsəfə doktoru Qulu Novruzov İctimai Şuranın üzvləri ilə görüşüb. Kollecdəki tədris prosesi haqqında məlumat verən Qulu Novruzov imtahanların təşkilində, keçirilməsində və qiymətləndirmə prosesində yeni mexanizmin tətbiq edilməsini bildirib. Məqsəd imtahanların şəffaf və obyektiv keçirilməsini təmin etmək, eyni zamanda təhsilalanların bilik və bacarıqlarının dəqiq müəyyənləşdirilməsidir. İmtahan biletlərinin sualları təhsilalanların səviyyələri nəzərə alınmaqla və açıq suallara üstünlük verməklə tərtib olunub. Aprel ayında müvafiq qruplarda pretest olunmuş biletlərin nəticələri müzakirə edilib və biletlər, suallar təkmilləşdirildikdən sonra imtahana hazır hesab olunub.

Dövlət Attestasiya və yaz semestrinin imtahan sessiyasının təşkili ilə bağlı Təhsil Nazirliyinin əmrlərinə əsasən kollecdə müvafiq əmrlər təsdiq edilib, İmtahan Qərargahı, sessiyanın gedişi və qiymətləndirmənin nəticələri ilə bağlı müraciət və şikayətlərə baxılması üçün Münaqişə Komissiyası yaradılıb.

Qiymətləndirmənin dəqiq, obyektiv aparılması və cavabların hərtərəfli dəyərləndirilməsi üçün hazırlanmış qiymətləndirmə meyarları təkmilləşdirilib. 0-10 bal sistemində hər bir bal üzrə tələbənin bilik və bacarıqlarını dəqiq ölçmək məqsədilə qiymətləndirmə üzrə yeni meyar cədvəli hazırlanıb və hər bal üçün açıq və qapalı suallara uyğun olaraq müvafiq meyarlar tərtib olunub.

# "Davamlı turizmin təbliği və inkişaf etdirilməsi məqsədilə uşaq və gənclər üçün yay məktəblərinin təşkili" ilə bağlı seminar



İyunun 20-də 2017-ci ilin ölkəmizdə "İnkişaf naminə beynəlxalq turizm ili" elan edilməsi ilə əlaqədar olaraq Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) rektoru, professor Cəfər Cəfərovun 30 may 2017-ci il tarixli 3/84 nömrəli əmrini əsas tutaraq hazırlanmış tədbirlər planına müvafiq olaraq Elm və innovasiyalar şöbəsi ADPU-nun və filialların fakültələri üçün "Davamlı turizmin təbliği və inkişaf etdirilməsi məqsədilə uşaq və gənclər üçün yay məktəblərinin təşkili" ilə bağlı təlimati seminar təşkil edib. Seminarı şöbənin baş mütəxəssisi Dilguşə Süleymanova aparıb.

Seminarda ADPU-nun və filialların fakültələri, ADPU-nun nəzdində Azərbaycan Dövlət Pedaqoji Kolleci (ADPK) daxil olmaqla 31 nəfər iştirak edib. Seminarda "Davamlı turizmin təbliği və inkişaf etdirilməsi" mövzusunda müxtəlif videoçarxlar, qlobal məqsədlərə həsr olunmuş animasiyalar, maraqlı təqdimatlar nümayiş etdirilib, Minilliyin İnkişaf Məqsədlərini (MİM) əks etdirən beynəlxalq problemlərdən danışılıb. Turizmin yalnız əyləncə və istirahət məqsədi daşımadığı araşdırılıb. Dünyanın inkişaf etmiş ölkələrinin gəlirlərinin ən azı 30 faizinin turizmlə bağlı olduğu vurğulanıb, turizmin ekoloji, sosial və iqtisadi mahiyyəti açıqlanıb. İştirakçılar mövzuların təqdimatı ilə yanaşı, müxtəlif fərqli iş üsulları ilə tanış olublar, onları maraqlandıran suallar təlimçi tərəfindən cavablandırılıb, bu aktual sahə ilə bağlı görüləcək işlərin mahiyyəti izah edilib.

Təlimdə iştirakçılara qiymətləndirmə məqsədilə vərəqlər paylanılıb. Seminarın sonunda xatirə şəkilləri çəkdirilib.

# Nitq mədəniyyəti barədə - VII yazı



Doğma ana dilini və əcnəbi dili öyrənərkən həmin dillərdə danışmağa çalışmaq lazımdır. Hər yerdə - mağazada, avtobusda, metroda, küçədə öyrəndiyin dilin imkanlarından istifadə etmək, həmin dilin imkanları ilə düşünmək işin xeyrinədir. Bunların hamısı nitqin mədəni olması üçün düşüncə, ünsiyyət vərdişlərini fəal edir. Düşündüyümüz dilin imkanları ilə ünsiyyət qurmaq nitq mədəniyyətini inkişaf etdirmək istiqamətində fəal rol oynayır. Müqayisə üçün qeyd edək ki, fonoqramla oxuyan müğənnilərdə düşündüyü dilin imkanları fəal olmur. Bu da nəticədə fonoqramla oxuyanın süni olaraq nitq mədəniyyətini yaradır. Süni olan nitq mədəniyyəti canlı ünsiyyətə deyil, sadəcə olaraq "ünsiyyət"ə xidmət edir.

Düşündüyümüz dilin imkanlarından istifadə etmək, bu dildə düşünmək beynin özünü düşündürür, bu isə beynin yaşamasıdır, beynin cavan qalmasıdır.Ümumiyyətlə, dildən istifadə etmək beyni düşündürür. Hətta bir neçə dili bilmək və dillərin imkanından istifadə etmək beynin cavanlaşmasında mühüm rol oynayır. Alimlərin araşdırmalarına görə, erkən yaşda xarici dili bilmə bacarığı beynin qocalmasının qarşısını alır. Edinburq Universitetinin Yaşlanma və Epidemoloji Mərkəzinin həkimi Tomas Bax apardığı tədqiqatlar nəticəsində belə bir qənaətə gəlib ki, yetkinlik yaşından sonra iki və daha artıq dildə danışmaq beyin üçün əhəmiyyətlidir. Araşdırmalar onu da təsdiq edir ki, dil bilmək və çoxlu mütaliə etmək beynin cavanlaşmasında mühüm rol oynayır. *(bax: Dil bilmək beyni qoruyur. - "Kaspi"qəzeti, 26 dekabr 2014, 214 (3309), s.24)*

Nitq mədəniyyətinə, nitqin mədəni səviyyəsinə verilən tələblərlə bağlı bəzi məqamlardan bəhs etməyi də vacib sayırıq. Həmin məqamlardan birincisi ondan ibarətdir ki, diktorun, aparıcının, mühazirəçinin nitq mədəniyyətinə qiymət verərkən onun məktəb yaratmasına mütləq fikir vermək lazımdır. Məktəb yaratmaq müəyyən qaydaları, qanunları, tələbləri ortaya qoymaqdır. Başqalarının fəaliyyətini yaratdığı qaydalar, qanunlar, tələblər əsasında tənzimləməkdir. Belə məktəbi olan və öz səsi, diksiyası, mətni oxumaq məharəti ilə fərqlənənlərdən biri də Aydın Qaradağlı olubdur. Aydın Qaradağlı məktəbi nitq mədəniyyətinin tələblərinə cavab verən məktəb olubdur. Onun oğlu Vüqar Qaradağlının müsahibəsindən bir məqam: "Diktorluq məktəbinin olması nə deməkdir? Müəyyən sistem olsun, müəyyən qaydalar, tələblər ortaya qoyulsun. Aydın Qaradağlı məktəbi niyə deyirlər? Çünki diktorluq peşəsi ilə yeganə məşğul olan insan atam idi. Diktor kimi fəxri adı da ilk olaraq atam almışdı. Moskvada atamın Olqa Vısotskaya adlı müəllimi var idi. O, həqiqətən, böyük sənətkar olub. Atam diktorluq sahəsində ona oxşamasını özünə şərəf bilirdi". (bax: Xatirələrdə yaşayan yaxşılar - Aydın Qaradağlı kimi. - "Kaspi" qəzeti, 29 yanvar 2015, 017 (3328), s.8) Məktəbi olan diktorlara, aparıcılara, mühazirəçilərə müəllim-ustad kimi yanaşırlar. Vaxtilə Aydın Qaradağlı da belə müəllim-ustadlara hörmətlə yanaşmışdır. Moskvada böyük məktəb yaratmış Olqa Vısotskayanı, eyni zamanda Teatr Məktəbində ona dərs demiş böyük sənətkar Kazım Ziyanı özünə ustad - müəllim hesab etmişdir.

Kazım Ziyanın aktyor kimi yaradıcılıq təcrübəsi həmişə gənclər tərəfindən öyrənilməlidir. Mehdi Hüseynin Kazım Ziyanın səhnə fəaliyyətinin 30 illiyi ilə bağlı 1945-ci ildə yazdığı "Kazım Ziya" adlı məqaləsində oxuyuruq: "Kazım Ziya səhnədə həyati danışıqlara qüvvətli meyil göstərir və demək olar ki, hər zaman bədii surətləri öz təbii və real zəmini ilə bağlamağa müvəffəq olur. Gənc aktyorlar onun bu yaradıcılıq təcrübəsindən çox şey öyrənə bilərlər və öyrənməlidirlər. Kazım Ziya öz səhnə yaradıcılığı təcrübəsini gənclərə də öyrətməyin zərurətini hiss edir. O, teatr məktəbində və studiyada illərdən bəri səhnə dili dərsləri verməklə yeni kadrlar yaratmaq sahəsində də təqdirəlayiq işlər görmüşdür". (bax: Mehdi Hüseyn. Kazım Ziya (səhnə fəaliyyətinin 30 illiyi). - Buludxan Xəlilov. Azərbaycan dili antologiyası. Bakı, "Bakı Çap Evi" nəşriyyatı, 2013, s.424-425) Kazım Ziya səhnə dili dərslərində öz istəyinə həm də ona görə nail olmuşdu ki, o, Azərbaycan dilinin bütün zənginliklərini mənimsəmişdi. Bu da aktyor üçün çox vacib şərtlərdən biridir. Məhz Kazım Ziya istedadı, yaradıcılıq potensialı ilə yanaşı, həm də Azərbaycan dilinin zənginliklərini mənimsəmişdi. Ona görə də onun bədii qiraət üsulu da maraqlı olmuşdur. Kazm Ziyanın bu sahədəki fəaliyyəti də aktyorluq sahəsindəki istedadını üzə çıxarmışdır. Mehdi Hüseyn yazır: "Kazım Ziya səhnə yaradıcılığı ilə yanaşı, bədii qiraətlə də məşğul olur. Onun hekayələr və şeirlər söyləmək üsulu da çox maraqlıdır. Burada da biz yenə mahir bir söz ustası ilə qarşılaşırıq. Nizaminin dastanlarından, "Dədə Qorqud" boylarından söylədiyi ayrı-ayrı parçalar, Kazım Ziyanın aktyor sənəti sahəsində geniş istedada malik olduğunu aydın göstərməkdədir. Bəzən çox əhəmiyyətsiz görünən misralar onun ifasında o qədər dərin məna kəsb edir ki, biz qeyri-şüuri olaraq, söylənən bədii əsərin hər bir parçasının üzvi bir vəhdət təşkil etdiyini daha möhkəm hiss etməyə başlayırıq". (bax: Mehdi Hüseyn. Kazım Ziya (səhnə fəaliyyətinin 30 illiyi). - Buludxan Xəlilov. Azərbaycan dili antologiyası. Bakı, "Bakı Çap Evi" nəşriyyatı, 2013, s.425) Deməli, həyat təcrübəsi, eləcə də yaradıcılıq təcrübəsi, istedad, sözlərdən, ifadələrdən, cümlələrdən düzgün istifadə etmək, yəni dilin bütün imkanlarını öz təbiiliyi ilə ifadə etmək qabiliyyəti, bütün bunların hamısı aktyor üçün vacib şərtlərdir. Aktyor səhnə dilinin nəzəri məsələlərini də, səhnə dilinin praktik cəhətlərini də yaxşı bilməklə yanaşı, onları bir-biri ilə məqamında və yerində əlaqələndirməyi bacarmalıdır. Kazım Ziya kimi. Mehdi Hüseynin sözləri ilə desək: "Kazım Ziyanın aktyor sənəti səhnədə təbii danışıq əsasında inkişaf etmişdir. Heç də təsadüfi deyildir ki, o, səhnə dilinin nəzəri məsələləri ilə də yaxından məşğul olur. Həqiqi realizmi tətbiq etməyə çalışan bu sənətkar, kitab dili ilə canlı danışıq dili arasındakı fərqi də çox düzgün anlamışdır. Səhnədə sözlər, cümlələr olduğu zaman, əlbəttə, ifa edilən hər bir insan surəti öz təbiiliyini itirir. Bunu Kazım Ziya öz həyat təcrübəsindən bilir. Səhnəni canlı həyatın bədii inikas forması kimi qəbul edən hər bir sənətkar da bunu mütləq bilməlidir". *(bax: Mehdi Hüseyn. Kazım Ziya (səhnə fəaliyyətinin 30 illiyi). - Buludxan Xəlilov. Azərbaycan dili antologiyası. Bakı, "Bakı Çap Evi" nəşriyyatı, 2013. s.424)*

**Buludxan Xəlilov,**
**Filologiya fakültəsinin dekanı,**
**filologiya üzrə elmlər doktoru,**
**professor**

# Filologiya fakültəsi Elmi Şurasının iclası

İyunun 20-də Filologiya fakültəsinin Elmi Şurasının növbəti iclası keçirilmişdir. Fakültənin dekanı, Elmi Şuranın sədri, professor Buludxan Xəlilov Filologiya fakültəsinin dosenti, şair-ədəbiyyatşünas Təranə Turan Rəhimlinin növbəti uğurundan danışdı, onun İtaliyada Beynəlxalq Ədəbiyyat və Kinematoqrafiya Müsabiqəsinin qalibi olduğunu qeyd etdi və böyük yaradıcılıq uğurları arzuladı.



Elmi Şura üzvlərinin nəzərinə çatdırıldı ki, aprelin 26-da İtaliyanın cənub bölgəsində Böyük Kalabriya inzibati ərazisinin Torre Melissa şəhərində keçirilən "VELİERO" Beynəlxalq Ədəbiyyat və Kinematoqrafiya Müsabiqəsində Azərbaycanı təmsil edən Təranə Turan Rəhimli "Sənə yazmadığım şeir" adlı şeiri ilə Poeziya bölməsi üzrə müsabiqə qalibi olmuşdur.



Sonra professor Buludxan Xəlilov gündəlikdə duran ilk məsələ-seçkidə iştirak edən fənn müəllimlərinin dərslərinin dəyərləndirilməsi barədə məlumatla çıxış etmək üçün sözü fakültə Tədris-Metodiki Şurasının sədri, professor Zahid Xəlilə verdi. Professor Z.Xəlil Filologiya fakültəsi üzrə 21 yerə 102 ərizənin verildiyini, müzakirələrin obyektiv keçirildiyini, mütəxəssislərin, Tədris-Metodika Şura üzvlərinin məsuliyyətlə çalışdığını xüsusi vurğuladı və bütün əməkdaşlara təşəkkürünü bildirdi.

Sonra IV tədris ili tələbələrinin pedaqoji təcrübəsinin yekunlarına dair hesabatla dekan müavini, dosent Pəri Paşayeva çıxış etdi. Dosent P.Paşayeva fevral ayının 15-dən may ayının 31-nə qədərki bir dövrü əhatə edən pedaqoji təcrübənin universitetlə müqaviləsi olan 95 və 138 nömrəli tam orta məktəblərdə uğurla keçdiyini, metodist və tələbələrin fəallığını xüsusi qeyd etdi. Məktəb rəhbərlərinin ayrı-ayrı tələbələri diplom və fəxri fərmanlarla təltif etdiyini, dekanlıq tərəfindən isə 13 tələbənin diplomla mükafatlandırıldığını bildirdi.

Professor B.Xəlilov pedaqoji təcrübədə fəal olan metodist müəllimlər və tələbələr barədə məktəblərdən gələn təşəkkür məktublarını Şura üzvlərinin nəzərinə çatdırdı. Sonda isə fakültə elmi katibi, dosent Sevinc Sadıxova Şura üzvlərini cari məsələlərlə tanış etdi. Cari məsələlərdə 1 nəfərin dissertasiya mövzusu və elmi rəhbəri təsdiq olundu, 5 əməkdaşın dərs vəsaiti və dərsliyi müzakirə olundu və onların çap olunması, 3 əməkdaşın kitablarının kitabxanaya alınması məqsədəuyğun sayıldı.

# "Almanlar Cənubi Qafqazda: 200 il" mövzusunda tədbir

İyunun 9-da Beynəlxalq Dialoq və İnkişaf Alyansının təşkilatçılığı ilə "Almanlar Cənubi Qafqazda: 200 il" mövzusunda tədbir keçirilmişdir. Azərbaycan Respublikasının Prezidenti cənab İlham Əliyevin "2017-ci ildə Cənubi Qafqaz regionunda alman məskənlərinin salınmasının 200 illiyinin qeyd olunması haqqında" imzaladığı Sərəncama uyğun olaraq keçirilən tədbiri giriş sözü ilə açan Beynəlxalq Dialoq və İnkişaf Alyansının sədri Nüşabə Məmmədova bildirdi ki, bu sahədə tədbirlərin keçirilməsi müasir dövrdə müstəqil Azərbaycan dövlətinin gerçəkləşdirilən siyasətinin multikulturalizm və tolerantlıq prinsiplərinin bariz nümunəsidir.



Tədbirdə Almaniya-Azərbaycan Cəmiyyətinin sədri Çingiz Abdullayev, Almaniya-Azərbaycan Xarici Ticarət Palatasının icraçı direktoru Tobias Baumann, Azərbaycan Milli Qeyri-Hökumət Təşkilatları Forumunun İdarə Heyətinin sədri Qorxmaz İbrahimli, Azərbaycan Dillər Universitetinin dosenti Samir Həmidov, Azərbaycan Milli Elmlər Akademiyasının (AMEA) Hüquq və İnsan Haqları İnstitutunun direktor müavini Lalə Əhmədova, AMEA-nın Tarix İnstitutunun aparıcı elmi işçisi İkram Ağasıyev, Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) Tarix və coğrafiya fakültəsinin Azərbaycan tarixi kafedrasının müdiri Naibə Əhmədova və digər şəxslər öz çıxışlarında Azərbaycanda yüzillər boyu bərqərar olmuş tolerantlıq mühitinin XIX əsrin əvvəllərində buraya köçürülən alman mühacirlərinin yerli əhali ilə qısa müddətdə dərin ünsiyyət qurması üçün əlverişli zəmin yaratdığını, həmçinin milli dəyərlərə qarşılıqlı hörmət və ehtiramın Azərbaycan və alman xalqlarının mədəni əlaqələrini səciyyələndirən başlıca cəhət olduğunu bildirmişlər. Tədbirdə Almaniyanın Azərbaycandakı səfirliyinin nümayəndəsi, Bakıdakı alman təşkilatlarının nümayəndələri, QHT və KİV nümayəndələri iştirak etmişlər.

**Nurlan Səmədov**

# "Davamlı turizmin təbliği və inkişaf etdirilməsi" mövzusunda növbəti seminar

İyunun 23-də 2017-ci ilin ölkəmizdə "İnkişaf naminə beynəlxalq turizm ili" elan edilməsi ilə əlaqədar olaraq Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) rektoru, professor Cəfər Cəfərovun 30 may 2017-ci il tarixli 3/84 nömrəli əmrini əsas tutaraq hazırlanmış tədbirlər planına müvafiq olaraq Elm və innovasiyalar şöbəsi tərəfindən Kimya və biologiya fakültəsinin III tədris ilinin "Biologiya" ixtisası üzrə təhsil alan tələbələri üçün "Davamlı turizmin təbliği və inkişaf etdirilməsi"mövzusunda təlimati seminar təşkil edilib.



Seminarı şöbənin mütəxəssisi Vəfa Əhmədova aparıb. Qeyd edək ki, seminar fəal-interaktiv təlim metodları əsasında keçirilib. Seminarda "Davamlı turizmin təbliği və inkişaf etdirilməsi" mövzusunda maarifləndirici, eyni zamanda düşündürücü videoçarxlar, qlobal məqsədlərə həsr olunmuş animasiyalar nümayiş etdirilib, Minilliyin İnkişaf Məqsədləri (MİM), eləcə də Davamlı İnkişaf Məqsədlərini (DİM) əks etdirən beynəlxalq problemlərdən, son illər müxtəlif mötəbər idman oyunlarının, yarışların ölkəmizdə təşkilinin turizmin inkişafına təkan verməsindən geniş söz açılıb, bu sahədə tələbələrin maraqlı fikir və təklifləri dinlənilib.

Təlim zamanı DİM-lə bağlı 2030-cu ilə kimi gözləntilər, ekoloji, iqtisadi və sosial istiqamətlər üzrə statistik məlumatlar açıqlanıb.

# ADPU-nun Cəlilabad Filialında "Davamlı turizmin təbliği və inkişaf etdirilməsi məqsədilə uşaq və gənclər üçün yay məktəblərinin təşkili" ilə bağlı təlim

2017-ci ilin "İnkişaf naminə beynəlxalq turizm ili" elan edilməsi ilə əlaqədar olaraq Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) rektoru, professor Cəfər Cəfərovun 30 may 2017-ci il tarixli 3/84 nömrəli əmrini əsas tutaraq hazır-lanmış günlük-22, 23, 24, 29, 30 iyun tarixlərində təlimlər həyata keçirilib. 16 nəfər tələbənin iştirak etdiyi təlimləri filialın əməkdaşı Dürdanə Əliyeva aparıb. Təlim proqramı layihəsi əsasında interaktiv məşğələlərdə 7 müxtəlif mövzuda fikir mübadiləsi və diskussiyalar



təd-birlər planına müvafiq olaraq Elm və innovasiyalar şöbəsi tərəfindən ADPU və filiallarının fakültələri üçün "Davamlı turizmin təbliği və inkişaf etdirilməsi məqsədilə uşaq və gənclər üçün yay məktəblərinin təşkili" ilə bağlı hazırlanmış Təlim Proqramına əsasən ADPU-nun Cəlilabad Filialında təlim keçirilib.

Filialda "Davamlı turizmin təbliği və inkişaf etdirilməsi məqsədilə uşaq və gənclər üçün yay məktəblərinin təşkili" ilə bağlı təklif edilən Təlim Paketinə əsasən 5 aparılıb, "Turizmlə bağlı minilliyin inkişaf məqsədləri (MİM)", "İnkişaf naminə beynəlxalq davamlı turizm", "Təhsil dünyanı dəyişə bilər", "Sülh, ədalət və güclü institutlar", "Yolu yarıya qədər getmək mənasızdır", "Ətraf mühit - eko-turizmin formalaşması", "Hamı üçün təmiz su", "Gender bərabərliyi və insan inkişafı" adlı mövzularda müzakirələr aparılıb, təbiətə ekskursiyalar təşkil olunub.

Təlim proqramının sonunda iştirakçılar sertifikatlarla təltif edilib.

# Kimya və biologiya fakültəsinin "Yeni bioloji aktiv birləşmələr" elmi-tədqiqat laboratoriyasının əməkdaşları beynəlxalq konfransda

Kimya və biologiya fakültəsinin "Yeni bioloji aktiv birləşmələr" elmi-tədqiqat laboratoriyasının (ETL) əməkdaşları Sevinc Rəhimova və Pərvin Ələsgərova iyunun 29-30-da Azərbaycan Milli Elmlər Akademiyasının (AMEA) Neft-Kimya Prosesləri İnstitutunun təşkilatçılığı ilə Əməkdar elm xadimi, akademik Bahadur Zeynalovun 100 illik yubileyinə həsr olunmuş "Neft-kimya sintezi və mürəkkəb kondensləşmiş sistemlərdə kataliz" mövzusunda keçirilən ikigünlük beynəlxalq elmi-texniki konfransda iştirak ediblər. Qeyd edək ki, konfransda Rusiya, Böyük Britaniya, Belarus, Gürcüstan və Qazaxıstanın tanınmış alimləri iştirak ediblər.

ETL-in əməkdaşları konfransda "1-heksiltiooktan-2-olun alkoksimetil və asetoksi törəmələrinin sintezi və xassələri" və "1,2-epitio-3-benzitiazolun bəzi törəmələrinin sintezi və onların funksional xassələrinin tədqiqi" mövzusunda elmi-tədqiqat işlərini iştirakçılara təqdim ediblər. Onların təqdim etdikləri nəticələr konfrans iştirakçılarının marağına səbəb olub.

# ADPU-nun Şəki Filialında "Davamlı turizm ili"nə həsr olunmuş yay məktəbinin təlimləri başa çatmışdır

İyunun 20-24-də Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) Şəki Filialında davamlı turizmin təbliği və inkişaf etdirilməsi məqsədilə tələbə-gənclər üçün 5 günlük yay məktəbinin məşğələləri keçirilmişdir. Təlim proqramı layihəsi əsasında təşkil olunmuş məşğələləri ADPU-nun Elm və innovasiyalar şöbəsinin baş mütəxəssisi Dilguşə Süleymanova aparmışdır.



İnteraktiv məşğələlərdə 6 müxtəlif mövzuda fikir mübadiləsi və diskussiyalar aparılmış, "Turizmlə bağlı minilliyin inkişaf məqsədləri", "İnkişaf naminə beynəlxalq davamlı turizm ili", "Təhsil dünyanı dəyişə bilər", "Sülh, ədalət və güclü institutlar", "Yolu yarıya qədər getmək mənasızdır", "Ətraf mühit - eko-turizmin formalaşması", "Gender bərabərliyi və insan inkişafı" adlı mövzularda müzakirələr keçirilmiş, təbiətə ekskursiyalar təşkil olunmuşdur.

Treninqlərdə minilliyin qlobal çağırışları əsasında hədəflər müəyyən edilmiş, sonunda iştirakçılara sertifikatlar təqdim olunmuşdur.

# Allah rəhmət eləsin!

Azərbaycan Dövlət Pedaqoji Universitetinin kollektivi Üzvi kimya və kimya texnologiyası kafedrasının dosenti Rəfiqə Məmmədovaya əzizi

**Raqib Məmmədovun**

vəfatından kədərləndiyini bildirir və dərin hüznlə başsağlığı verir.

---

Azərbaycan Dövlət Pedaqoji Universitetinin kollektivi Fiziki tərbiyə və çağırışaqədər hazırlıq kafedrasının müəllimi Məsim Quliyevə atası

**Allahverdi Quliyevin**

vəfatından kədərləndiyini bildirir və dərin hüznlə başsağlığı verir.

---

Azərbaycan Dövlət Pedaqoji Universitetinin kollektivi Botanika kafedrasının əməkdaşı

**Arzu Əliyevin**

vəfatından kədərləndiyini bildirir, mərhumun ailəsinə və yaxınlarına dərin hüznlə başsağlığı verir.

Redaktor: Nigar ABBASOVA
Məsul katib: Mahirə MUSTAFAYEVA
ÜNVANIMIZ: Bakı, Ü. Hacıbəyli küçəsi, 68 ADPU, Tel.: 498-18-41
Məqalələrdəki faktlara görə redaksiya məsuliyyət daşımır
ADPU-nun web-portalı: adpu.edu.az
Fotolar Nurlan Səmədovundur
Şəhadətnamə № 191
Sifariş: 1921
Sayı: 1500
Çapa imzalanıb: 30.06.2017-ci il
ADPU-nun İctimaiyyətlə əlaqələr şöbəsinin kompüter mərkəzində yığılıb, "Azərbaycan" nəşriyyatında səhifələnib və "Azərbaycan" nəşriyyatının mətbəəsində ofset üsulu ilə çap edilmişdir.